# Mündəricat

# AYƏTULLAHÜL–ÜZMA BEHCƏTİN HƏYATI

## Kitab haqqında

Kitabın adı:Ayətullahül–üzma Behcətin həyatı

Müəllif:Məlahət Əsədova

Naşir:Şəhriyar

Çap tarixi:۲۰۰۷

Səhifələrin sayı:۱۲۸

Çap növbəsi:İkinci

Tirajı:۳۰۰۰

səh:۱

## MÜNDƏRİCAT

Mö`minlərin nəzərinə çatdırmaq istəyirik ki, Allah-təala hər zaman, elə bizim dövrümüzdə də bə`zən bəndələrə xüsusi məhəbbət göstərir. “Hər kəs haqq yolunda ”.sadiq olsa, Allah onu hidayət edər

Təkamül və insaniyyət yolu bəndələr üçün həmişə açıqdır. Əgər insan zəhmət çəksə, indiki zamanımızda da İmam Zamanın (ə) diqqəti sayəsində Allaha doğru gedən yolun sadiq yolçusuna çevrilər və kamil məqama çatar. Həqiqətən, bunlar bizə ümid verir və imanımızı təkamülə doğru sövq etdirir. Dediklərimiz əfsanə olmayıb, sübuta yetmiş eyni həqiqətlərdir. Bu həqiqətləri dərk edərək qəlblərimizi dünya bağlılıqlarından azad edə bilsək, mə`nəvi ləzzətlərin maddi ləzzətlərdən qat-qat üstün olduğunu daha yaxşı başa düşərik. Təəssüflər olsun ki, bir tərəfdən mə`rifət və iman zəifliyi, digər tərəfdən də batini və zahiri şeytani amillərin hücumu üstünlük təşkil etdiyinə görə belə qiymətli xalis incilərə az diqqət edilir. Burada biz o böyük şəxsiyyətlərdən biri ilə yaxından tanış .olacağıq

Böyük arif həzrət Ayətullah-üzma Şeyx Məhəmməd Təqi Behcət Fuməni ۱۹۱۳-cü ildə Gilan vilayətinin Fumən şəhərində dindar bir ailədə dünyaya göz açıb. Atası Kərbəlayi Mahmud Behcət şəhərin hörmətli və tanınmış şəxslərindən olub. O, əkinçilikdən əlavə, şəhər əhalisinə idarə işlərində də yardım edirmiş. Camaatın e`timadını qazandığı üçün onun adı sənədlərdə zamin kimi qeyd olunur. Ədəbiyyat sahəsində gözəl zövqə malik olan Kərbəlayi Mahmudun yazdığı şe`rlərdə Əhli-beyt (ə), o cümlədən İmam Hüseynin (ə) və Kərbəla şəhidlərinin adı xüsusi vurğulanır. Aradan

yarım əsr keçməsinə baxmayaraq, bu şe`rlər hələ də o diyarın xətib əhli və (məddahlarının dillər əzbəridir.(۱)

Behcət bir il dörd aylığında ikən anası vəfat edir.(۲) Elə körpəlikdən yetim qalaraq çətinliklərlə üz-üzə duran Behcət bu ilahi imtahanda sınanmaq üçün enişli-yoxuşlu .yollar keçməli olur

## O, MƏHƏMMƏDTƏQİNİN ATASIDIR

İlahi insanların haqq yola hidayət olunması və onların bu yolda təkamülə çatmasında Allah-təalanın gözəl və aşkar tədbiri vardır. Bu ibrətamiz gözəlliklərdən ariflər şeyxi Ayətullah Behcətin həyatında olduqca çoxdur. Onlardan biri atasının cavanlıqda başına :gələn maraqlı əhvalatdır. Həmin əhvalat belədir

Behcətin atası təqribən on yeddi yaşında olarkən vəba xəstəliyinə yoluxub yatağa düşür. Vəziyyəti ağır olduğundan onun sağ qalacağına heç kimin ümidi qalmır. Behcətin atası özü belə nəql edir: Həmin ağır vəziyyətdə olduğum vaxt, qəribə bir səs ".eşitdim. Kimsə deyirdi: "Onunla işiniz olmasın. O, Məhəmməd Təqinin atasıdır

Elə bu vaxt dərin yuxuya gedir və hamı onun rəhmətə getdiyini güman edir. Amma bir müddət keçəndən sonra yavaş-yavaş tamamilə sağalır. Bu hadisədən bir neçə il sonra evlənmək qərarına gəlir və artıq o əhvalatı (xəstəlik) yadından çıxarır. Evləndikdən sonra ilk övladının adını Mehdi qoyur. İkinci övladı qız olur. Üçüncü uşağının adını Məhəmməd Hüseyn qoyur. Dördüncü övladı dünyaya gələndə ağır xəstə olduğu vaxt eşitdiyi səsi xatırlayır və buna görə də onu Məhəmməd Təqi deyə çağırır. Amma Allah-təala onun bu övladı üçün qəribə alın yazısı yazıbmış. Bu uşaq elə körpə ikən su hovuzuna düşüb boğulur. Allah ona başqa bir övlad da nəsib edir. O, bunun da adını .Məhəmməd Təqi qoyur



---

Setareqane hidayət", Hüseyn Avərdi, səh. ۳۵-۳۶" [۱]-۱

Bərgi əz dəftəre aftab", Rza Baqirzadə, səh. ۱۱" [۲]-۲

İllər keçdikdən sonra həmin uşaq zamanımızın ariflər şeyxinə–Ayətullah-Üzma Şeyx (Məhəmməd Təqi Behcətə çevrilir.(١)

## MƏHƏMMƏDTƏQİ BEHCƏTİN TƏHSİLİ

Ayətullah Behcət ibtidai təhsilini Fuməndə başa vurduqdan sonra, dini elmləri .öyrənməyə başlayır

Elə uşaq yaşlarından böyük ruha malik olan Məhəmməd Təqi uşaq oyunları oynamaqdan pərhiz edərmiş. Təhsilə olan böyük marağı və iste`dadı bais olur ki, elə .ilk günlərdən şəhərin ruhanilərilə get-gəli artsın

ci ildə ərəb ədəbiyyatını bitirdikdən sonra, hövzə elmlərini təkmilləşdirmək üçün-١٩٢٧ hicrət etmək qərarına gəlir. Əvvəlcə Qum şəhərinə yollanır. O zamanlar hələ Qum elmi hövzəsi yaranmamışdı. Bir müddət bu şəhərdə qalandan sonra aşiqlər diyarı Kərbəlaya yollanır. Təqribən dörd il bu şəhərdə sakin olan Məhəmməd Təqi dini təhsil almaqla yanaşı nəfsinin islahı ilə də məşğul olur. O, bu diyarın böyük ustadlarından .olan Şeyx Əbdül Qasim Xoyinin(٢) dərslərindən də səmərəli istifadə edir

Təhsilini davam etdirmək və dini elmlərə daha dərindən yiyələnmək üçün ١٩٣١-ci ildə Nəcəf-Əşrəfə hicrət edir. Ali təhsilin son mərhələlərini Nəcəfin yüksək dərəcəli alimlərindən kəsb edərək başa vurur. Onların sırasında Şeyx Mürtəza Taliqani kimi .tanınmış şəxslərin adı qeyd olunur

Ayətullah Behcət Hacı Ziya Əraqi və Mirzə Naininin dərslərini bitirdikdən sonra Şeyx Məhəmməd Qərəvi İsfahaninin çox yüksək səthdə hövzə dərslərinə qatılır, ali fiqh və üsul nəzərlərini beləcə daha da təkmilləşdirir. O, həmin vaxtlar ٢٠ yaşlı bir cavan olmasına baxmayaraq, yüksək qavrama qabiliyyətinə malik imiş. Keçilən hər dərsə tənqidi-təhlili baxımdan yanaşma bacarığı onun çox tez bir zamanda elmi və mə`nəvi təkamülə çatacağından



---

Bərgi əz dəftəre aftab", Rza Baqirzadə, səh. ١١-١٢" [٣] -١

.Məşhur mərcəi-təqlid olan Xoyi deyil [۴] -٢

xəbər verirmiş. Nəcəf alimlərindən biri bu barədə belə deyir: “O, çox vaxt Ayətullah Kompaninin dərslərində bəhsə qatılır və yeri gələndə öz fikrini söyləməyi də çox yaxşı bacarırdı.”

O, eləcə də Seyyid Əbülhəsən İsfahani, Şeyx Məhəmməd Kazim Şirazidən dərs almış və həmçinin Ayətullah Milaninin “məkasib” dərslərində də iştirak etmişdir.

Ayətullah Behcət mərhum Seyyid Hüseyn Badkubinin yanında fiqh və üsul bəhslərini öyrənməklə yanaşı, İbn Sinanın “İşarat və Tənbihat” və Molla Sədranın “Əsfari ərbəə” kitablarını da mənimsəmişdir. O, bu dərslərə məşğul olduğu zaman Nəcəfdə ali səthdə hövzə dərslərini tədris edirmiş. Behcət “kifayə” tədris edən təcrübəli müəllimlərdən hesab olunurmuş. Bütün bunlardan əlavə “Səfinətül-bihar” kitabının yazılmasında Abbas Qummi ilə həmkarlığı olubmuş. Hal-hazırda “Səfinətül-bihar”ın Behcət tərəfindən yazılmış əlyazma nüsxəsinin böyük bir hissəsi mövcuddur.(١)

### AYƏTULLAH BEHCƏT VƏ TƏHSİLDƏ TƏLATÜM

Yuxarıda qeyd olunduğu kimi, Ayətullah Behcət elm yolunda rahatlıq nə olduğunu bilməyib. O, islam maarifini kamil mənimsəmək üçün bütün gücünü bu səmtə yönəldibmiş. Nəcəf alimlərindən biri bu barədə deyir: “Siz Behcətin zahirdə bu cür sakit olmasına baxmayın. O, rəhmətlik Qərəvi İsfahaninin (Kompani) dərsində ustada aman vermirdi. Hey irad tutur, məntiqli suallar verirdi. Bu mətləbi Ayətullah Milaniyə deyəndə, razılıq əlaməti ilə gülümsünüb demişdi: Ondakı bu iste`dadı görüb onu Şeyxin (Kompani) dərslərinə hazırlaşdırdım.” Behcət də ustadı Milaninin sözünə cavab olaraq belə deyir: “Onun (Milani) “Məkasib” dərsləri adi səth dərsləri sırasında yer tutsa da, bu dərsləri çox geniş və dərin izah edirdi. O əksər hallarda kitabdan iki-üç sətir söyləyib, qalan bütün dərsi (vaxtı) uyğun



---

١- [٥]

məsələ ətrafında bəhs edirdi. Həqiqətdə onun bu dərsləri “xaric” səthinə (ictihad (bölümlərinə) aid idi.”(١)

### TƏHSİLDƏKİ NAİLİYYƏTLƏRİ

Allaha bağlı olaraq yaşamaq səadətdir. Belə həyat tərzində təravətli sükut və qəribə lətiflik vardır və həyatın bütün sahələrində insana müvəffəqiyyət qazanmasında yardımçı olur. Təhsilə başladığı ilk günlərdəki fəzilət və zahidliyi onun çox tez bir zamanda tərəqqi edəcəyinə dəlalət edirdi. Deyilənə görə, Ayətullah Şahrudinin .“Kifayə” dərsində tələbələr arasında Ayətullah Behcət ən az yaşlısı idi

Günlərin birində Behcət öz müəlliminin “təqrir” dərsinə irad tutur. Tələbə yoldaşları onu ələ salıb gülürlər. Elə bu vaxt qapıdan içəri girən Ayətullah Şahrudi məsələnin nə yerdə olduğunu başa düşür. Deyir ki, onunla işiniz olmasın. Mən bu məsələni sizin üçün izah edərəm– deyən Ayətullah Şahrudi tələbələri sakitləşdirir. O əlavə edərək deyir: Mən dünən axşam Axundun təqriratını mütaliə etdim. Ayətullah Behcət düzgün irad tutmuşdur. Ayətullah Şahrudi onun dərsə qarşı bu cür ciddi olması və dərin (düşüncəsini alqışlayır.(٢

Əllamə Məhəmməd Təqi Cə`fəri buyurmuşdur: “Fiqhin xaric dərsinin “Məkasib” bölməsini Şeyx Kazim Şirazi bizə tədris edən zamanlar Behcət də bu dərsə gəlirdi. Dərs əsnasında sual verəndə Şeyx Kazim diqqətlə qulaq asar, onun suallarına dəqiq cavab verməyə çalışardı. Yə`ni Behcətin dəqiq və dərin suallarına xüsusi diqqət yetirərdi. Elə o vaxtlardan Nəcəfdə öz fəzl və irfani ilə tanınan Ayətullah Behcət, ariflər (ustadı Ağa Qazinin də yanına get-gəl edirdi.”(٣



---

.Setareqane hidayət”, Hüseyn Avərdi ٣٧-səh, ۴-cü cild“ [۶] -١

.Setareqane hidayət”, Hüseyn Avərdi, səh. ٣٧-٣٨, c. ۴“ [٧] -٢

”.Qəbəsat”, ikinci dövrə, ۴-cü nömrə, səh. ۵, “Əllamə Cə`fəri ilə müsahibədən“ [٨] -٣

## İRANA DÖNÜŞ

cü ildə Ayətullah Behcət qəlbi elm və mə`rifət nuru ilə cilalanmış bir halda vətəni–-۱۹۴۳ İrana geri dönür. Ayətullah Quçani deyir: “Ayətullah Behcət Nəcəf-Əşrəfdə olduğu müddətdə çəkdiyi ibadət və riyazət nəticəsində Allah tərəfindən ona iyirmi bir xüsusi kəramət bəxş edilmişdir. O bu barədə mənə danışanda, bu haqda kimsəyə bir söz deməməyimi istədi. Bir gün İmam Rzanın (ə) hərəmində Ayətullah Behcətlə görüşüb ondan soruşdum: Allah-təala tərəfindən əta olunan həmin iyirmi bir kəramət hələ də sizin ixtiyarınızdadırmı? Dedi: Bəli. Həmin iyirmi bir kəramətdən biri də budur ki, ”.istədiyim vaxt geri dönmədən arxamda nə baş verdiyini deyə bilərəm

Ayətullah Behcət İrana qayıtdıqdan sonra ailə həyatı qurur. Bir neçə ay Fuməndə (doğulduğu şəhər) yaşadıqdan sonra Nəcəf-Əşrəfdəki elmi hövzəyə qayıtmaq qərarına gəlir. Yolüstü Həzrət Mə`sumənin (ə) hərəmini ziyarət etmək və Qum elmi hövzəsi ilə yaxından tanış olmaq niyyətilə bu şəhərə yollanır. Elə bu vaxtlar bir neçə ay əvvəl Quma hicrət edən Ayətullah-Üzma Bürucerdi şəhərin dini-elmi hövzəsində fiqh və üsul dərslərinin “xaric bölməsi”ni və yüksək maarif dərslərini tədris edirdi. Nəcəf elmi hövzəsində böyük ustadların bir neçəsinin ölüm xəbərini eşidən Ayətullah Behcət .müqəddəs Qum şəhərində qalmağı qərara alır

Bu şəhərdə Ayətullah-Üzma Höccət Kuhkəmərinin dərslərindən və Ayətullah Bürucerdinin üsul və fiqh dərslərindən istifadə edən Ayətullah Behcət, elə ilk .günlərdən dillər əzbəri olur

## AYƏTULLAH BEHCƏT TƏDRİS SAHƏSİNDƏ

Ayətullah Behcət ۵۰ ildən çoxdur ki, fiqh və üsul dərslərinin “xaric bölməsi”ni tədris edir. Şöhrət və ad-sandan uzaq olmaq üçün həmişə öz evində dərs deyər. Hal-hazırda uzun .illər onun dərslərindən feyz almış alimlərin çoxu böyük ictihad məqamına çatmışlar

Ayətullah Behcət üsul dərslərinin tədrisində əksər alimlərdən fərqli olaraq, başqalarının nəzəriyyələrini söyləməkdən daha çox məsələ üzərində öz tədqiq və təhlillərini bəyan edər. O əvvəl qısa məzmunda digər alimlərin nəzərini söyləyəndən sonra öz nəzərini açıqlayıb təhlilə keçər. Buna görə də ibtidai hövzə tələbələri üçün onun "xaric" dərsləri olduqca ağır gəlir. Amma onun fiqh dərsi Qur`an ayələri və .rəvayətlərə istinad edildiyinə görə asan sayılır

Böyük ustadlardan biri belə nəql edir: "(Əlli il bundan əvvəl) Ayətullah Behcətin Qum şəhərində "xaric" dərsi tədris etdiyini eşidəndə çox sevindik. Rəhmətlik Qərəvi Kompaninin çox çətin və dəqiq nəzəriyyələrinin şərhini onun şagirdinin dilindən eşitməyə hövzədə böyük ehtiyac var idi. Hətta bir çoxları bu haqda Qərəvi Kompaniyə irad da tutmuşlar. Fazil şəxslərdən bir neçəsi ilə birlikdə Ayətullah Behcətin bu dərslərinə qatıldıq. Dərslərin başlamasından iki ay keçdiyinə baxmayaraq, rəhmətlik Qərəvi İsfahaninin "təqrir" və üslubuna heç bir işarə etməyən Ayətullah Behcətin fikirləri öz ustadının nəzəriyyələri ilə bərabər idi. O, dərsə başlayan kimi əsl mətləbi bəyan edir, ustadın (Ayətullah Qərəvi) nəzəriyyələrinə çox cüz`i işarə etdikdən sonra tədqiq və təhqiq mərhələsinə keçirdi. Hələ biz mərhum Qərəvinin nəzəriyyələrini doğru-düzgün başa düşməmiş Ayətullah Behcətin bəyan etdiyi dəqiq və çox ağır mətləblər də buna əlavə olurdu. Beləliklə, bizim işimiz lap çətinləşdi və dərsi tərk ".etməli olduq

səh:١۵

## BİRİNCİ FƏSİL

### Mə`nəviyyat yolçusu

Ayətullah Behcət mə`nəviyyat aləmində zati iste`dada malik bir şəxsdir. Kiçik yaşlarından ismət və paklığa xüsusi diqqət yetirən, bə`zən alimlərin namazlarında .iştirak edən Behcət mə`nəvi halları ələ gətirməyə uşaq yaşlarından sə`y edərmiş

O, on dörd yaşında olarkən Kərbəlaya ziyarətə gedir. Özü bu haqda deyir: “İmam Hüseynin (ə) hərəmində olduğum vaxt namaz qılarkən qəribə mə`nəvi hala sahib olan bir şəxslə rastlaşdım. O vaxtlar mükəlləf olmağıma hələ bir il qalırdı. Ertəsi gün hərəmdə sübh namazı qılarkən həmin şəxsə iqtida etdim. Namazda “cümə” surəsini oxumağa başladı. Onu da qeyd edim ki, bu şəxsin namazda olan qəribə halını o vaxta qədər heç kəsdə görməmişdim. Demək olar ki, sonralar bu halı çox az adamda görə ”.bildim

Bütün bu deyilənlər onun kiçik yaşlarından bə`zi yüksək məqamlı şəxslərin idrak və batinindən xəbərdar olmasına işarədir. Halbuki həmin şəxsin alim kimi tanınmasına baxmayaraq, heç kim onun belə yüksək məqam və mə`rifət sahibi olduğunu zənn .etmirdi

Etdiyi bütün moizələrin əsasını və kamala çatma yollarını günahları tərk etmək tövsiyyələri təşkil edir və bu mövzuya çox tə`kidlə yanaşır. Belə mə`nəvi halları dərk (və vəsf etmək, onun məqam və idrak sahibi olmasından xəbər verir.(١



---

.Yaxınlarından biri ilə müsahibədən [٩] -١

## Ustad Qazinin dərslərinə qatılması

Təlatümlü dənizə bənzər aramsız ruhu hündür ləpələri ilə torpağa baş qoymaq üçün həmişə sahilə doğru can atırdı. Ayətullah Behcət bu yolu keçən bir arif ustadın sorağında idi ki, əl-ələ verərək çox dəqiq və mürəkkəb olan insanlıq yolunu birgə getsin. Həmin vaxtlar Kərbəlada Əllamə Təbatəbainin qardaşı arif və böyük filosof olan Ayətullah Məhəmməd Həsən İlahi Təbatəbai Təbrizi ilə tanış olur. Ayətullah Təbatəbai Əllamə Qazinin şagirdlərindən idi. O, Ayətullah Behcətin Mirzə Əli Qazi ilə görüşməsinə imkan yaradır. Ayətullah Behcət ۱۷-۱۸ yaşlarında olarkən Qazinin əxlaq .dərslərinə qatılır.(۱) Bu isə onun axtardığı həmin inci idi

## Mə`nəvi yolun ilk çətinlikləri

Günəş xəlq olduğu vaxtdan onun şəfaverici şüalarının qarşısını almaq niyyəti də yaranmışdır. Yarasalar günəşin yandırıcı şüaları qarşısında aciz və kor olurlar. Bə`zi insanlar da başqalarının ələ gətirdiyi bir çox məsələləri özləri dərk etmədiklərindən, inkar etməyə çalışırlar. Bu cür yanlış düşüncə tərzi cəmiyyətdə əsaslı problemlər yaratmışdır. Tarix boyu həqiqət nurunun dərkindən aciz qalaraq övliya və mə`rifət sahiblərini həlakətə və dar ağacına sürükləyən insanlar çox olmuşdur. Əllamə :Təbatəbai bu məsələni öz qəzəlində belə qeyd edir

,Çe Həllacha rəfte bər darha

.Çe Fərhadha morde dər kuhha

Dar düşüncəli və naqis insanlar üçün mə`nəviyyat yolunun dərki çox çətindir. Bu bəd xislətli adamlar İlahi arif Ayətullah Behcətin seçdiyi səadət yolunda da əngəl yaratmağa çalışmışlar. Bə`zi e`timadlı şəxslər belə nəql



---

.Şagirdlərindən biri ilə müsahibədən [۱۰] -۱

edirlər ki, Ayətullah Behcətin Əllamə Qazi ilə get-gəl etdiyini eşidən və mə`rifət məsələsinə e`tiqadı olmayan Nəcəfin fazil şəxslərindən bir qismi Ayətullah Behcətin atasına məktub yazıb onun həqiqət yolundan azdığını və Əllamə Qazi ilə get-gəl etdiyini qeyd edirlər. Atası məktubun cavabında yazır ki, vacib əməllərdən başqa bir .şey öyrənməyinə və filankəslə (Ustad Qazi) get-gəl etməyinə razı deyiləm

Ayətullah Behcət atasının yazdığı məktubla əlaqədar Əllamə Qazidən üzərinə düşən vəzifəsini soruşur. Ustad Qazi ona bu barədə təqlid etdiyi müctəhiddən sual etməsini buyurur. Ayətullah Behcət, Seyyid Əbül-Həsən İsfahaninin yanına gedib, məsələnin nə yerdə olduğunu danışanda "atadan itaət etmək vacibdir"–deyə Seyyid İsfahaninin .cavabını eşidir

Bu əhvalatdan sonra dərin sükuta qərq olan Behcət daha heç kimlə danışmır. Hətta lazım olan şeyləri almaq üçün mədrəsə xidmətçisindən xahiş edir və yaxud kağız üzərinə yazıb bir söz demədən satıcıya verərdi. Oxuduğu Seyyid Məhəmməd Kazim Yəzdinin mədrəsəsində iki qapı vardı. Qapılardan biri geniş xiyabana, digəri isə dar küçəyə açılırdı. Camaatdan uzaq gəzən Behcət həmişə dar küçə qapısından get-gəl .edərdi

Ayətullah Behcətin dostu və tələbə yoldaşı Şeyx Abbas Quçani tələbəlik illərini belə yad edir: "Ayətullah Behcət sükut ixtiyar edəndən sonra mə`nəviyyat aləmindən onun ".qəlbinə qapılar açılır. O məndən xahiş etdi ki, bu sirri heç kimə açmayım

### Ayətullah Qərəvi İsfahanini xatırlarkən

Ayətullah Behcətin müəllimlərindən biri də Ayətullah Qərəvi İsfahani olmuşdur. Hacı Məhəmməd Həsən Muinüt-tüccarın oğlu və Kompani ləqəbiylə məşhur Şeyx Məhəmməd Hüseyn İsfahani Nəcəfi ١٨٧٥-ci ilin məhərrəm ayında dünyaya göz açmışdır. Ayətullah Seyyid Məhəmməd Hüseyn Tehrani onun şərhi-halını Ağa Bozorg :Tehraninin dilindən belə nəql edir

Qərəvi ibtidai dini dərsləri (müqəddimat) bitirdikdən sonra şiə aləminin böyük mərcələrindən Seyyid Məhəmməd Feşarəki İsfahani, Şeyx Rza Həmədani, Şeyx Məhəmməd Kazim Xorasani və başqalarının yanında fiqh və üsul dərslərini öyrənmişdir. Son zamanlar isə Axund Məhəmməd Kazimin dərslərinə gedərdi. O, on üç il Axundun elm gülüstanından bəhrələr götürmüş, yüksək sə`ylər nəticəsində fiqh .elmindən böyük sərmayə toplamışdır

Hikmət və fəlsəfə dərslərini Nəcəfin tanınmış ustadı Ayətullah Mirzə Məhəmməd Baqir İstehbanatinin yanında öyrənmişdir. Ayətullah Qərəvi İsfahani daha çox fəlsəfədə ad çıxarmış və bu elmin dirçəlməsində xüsusi rolu olmuşdur. Bütün bunlarla yanaşı kəlam, təfsir, tarix, irfan, ədəb elmlərində yüksək savadı olan Qərəvi İsfahani bir nazim və nasir kimi ərəb və fars dillərində də tanınmış qələm sahibi idi. O zamanın nadir şəxsiyyətlərindən olub ruhu həmişə mələkut aləmində pərvaz edər, ilahi mə`rifət dəryasında qərq olardı. Ustadı Axund Məhəmməd Kazimin vəfatından sonra Nəcəf şəhərində daha bariz şəkildə özünü göstərməyə başladı. Artıq fiqh və üsul dərslərini müstəqil tədris etməyə başlayan Ayətullah Qərəvinin dərslərində çoxlu tələbə iştirak edərdi. Nəcəf alimləri ona xüsusi hörmət göstərir, onun hərtərəfli bilik sahibi olduğunu təsdiq edərdilər. Onun dərsləri kəlam əhlinin ülfət məkanına çevrilmişdi. Çünki o, fiqh və üsulda, xüsusilə də fəlsəfədə dərin mühakimələr yürüdürdü. Əksərən hikmət elmini tədris edərdi. Bu sahədə olduqca dərin biliyə sahib olan Ayətullah Qərəvi öz .müasirlərindən daha üstün idi

O, var gücünü elmin tədris və təbliğinə həsr edər, tələbələr pərvanə kimi onu dövrəyə alardılar. Qərəvi üsuli-fiqh, fiqh, hikmət elmləri və ali fəlsəfənin nəzmə çəkilmiş .mənzum formasında çox dəyərli kitablar yazmışdır

İnfarkt keçirən Ayətullah Qərəvi müalicədən sonra tədricən gümrahlaşmağa (başlayarkən, qəfil dünyasını dəyişir.(١)

Tələbələrin daha çox ehtiyacı olduğu və elmindən bəhrə götürəcəkləri bir vaxtda Qərəvinin vəfatı hamı üçün gözlənilməz oldu. Onun vəfatı Nəcəf elmi hövzəsi üçün böyük zərbə idi. Çünki böyük fəqih Ayətullah Ziyauddin Əraqinin vəfatından bir həftə keçməmiş, Nəcəf elmi hövzəsi ikinci dahi şəxslə, yə`ni ۶۵ yaşlı ustad Qərəvi ilə də vidalaşmalı oldu. Ayətullah Əraqi ۱۹۴۰-cı il zilqə`də ayının ۲۸-də dünyasını dəyişdi. Nəcəf elmi hövzəsində hamının ümidi Qərəvi İsfahaniyə idi ki, Ayətullah Əraqinin yerini dolduracaqdır. Amma əcəl ona da fürsət vermədi. Ayətullah-Üzma Seyyid Cəmaləddin :Gülpayqani bu haqda belə nəql edir

Rəhmətlik Ziyauddin Əraqinin vəfatından sonra Nəcəf elmi hövzəsinin idarə“ hey`ətinə rəhbərlik və tədris işləri Qərəvi İsfahaniyə tapşırıldı. Heç kim onun belə tezliklə vəfat edəcəyini güman etmirdi. Artıq, Ayətullah Əraqinin vəfatından bir həftə keçirdi. Mən öz hücrəmdə gecə namazı qılırdım. “Vətr” namazının qunutunu oxuyarkən Ayətullah Əraqinin at üstündə gəldiyini çox aydın şəkildə gördüm. O, şeyx Məhəmməd Hüseynin (Qərəvi) evinə tərəf gedib içəri daxil oldu. Mən onun vəfat etdiyini yəqin etdim. Dan yeri söküldüyü zaman Əmirəl-mö`mininin (ə) hərəminin minarəsindən camaata xəbər vermək istəyərkən mən evdəkilərə dedim ki, indi Şeyx Məhəmməd Hüseyn Qərəvinin vəfat etdiyini deyəcəklər. Doğrudan da carçı o böyük şəxsiyyətin fani dünya ilə vidalaşma xəbərini deyərək camaatı meyit namazına çağırmağa ”.başladı

Mərhum Ayətullah Şeyx Məhəmməd Hüseyn müraqibə, mühasibə və sükut əhli idi. Daim fikrə qərq olar, çox az hallarda danışardı. Əksər məclislərdə elmi mübahisələr getdiyi zaman o sükut edər, daha çox qulaq asmağa üstünlük verərdi. Məclisdə harada boş yer olsa, keçib orada da oturardı. Olduqca



---

Nuqəbaül-bəşər”, Ağa Bozorg Tehrani, ۲-ci cild, səh. ۵۶۰-۵۶۲“ [۱۱]-۱

təvazökar, xoş əxlaqlı və sakit təbiətli bir insan idi. Atası Kazimeynin adlı-sanlı tacirlərindən biri olduğuna görə, oğluna (Qərəvi) ondan çoxlu var-dövlət qalmışdı. Ömrünün son illərini çox yoxsulluqla keçirən Qərəvi həmişə qəlbi şad, gülərüz və möhkəm iradəli idi. Nəcəf-Əşrəf alimlərindən Seyyid Məhəmməd Rza Xəlxali belə nəql edir: "Bir gün Huvəyş bazarına getmişdim. Bazarda Şeyx Məhəmməd Hüseyni gördüm. Küçənin ortasında əyilib yerə dağılan soğanları yığır və öz-özünə hey gülürdü. Mən salam verib, soğanları yığmağa ona kömək etdim. O, soğanları köynəyinin ətəyinə yığandan sonra evinə yollandı. Mən dedim: Mə`lumdur ki, soğanlar sizin köynəyinizin ətəyindən yerə tökülürmüş, amma gülüşünüzün səbəbini anlaya bilmədim. Rəhmətlik şeyx dedi: Cavan yaşlarımda təhsil üçün Nəcəfə gələndə maddi cəhətdən heç bir problemim yox idi. Bahalı libas geyinər, qiymətli təsbih və üzük gəzdirərdim. Bir gün Həzrət Əmirəlmö`mininin (ə) hərəmində ziyarət edərkən, təsbihimin ipi qırıldı və dənələri yerə töküldü. Hər dənəsi bir dinara bərabər olan çox qiymətli təsbih idi. İzzəti-nəfs və ya lovğalığım məni əyilib yerə tökülən təsbih dənələrini yığmağa qoymadı. Bunu özümə yaraşdırmadığım üçün, həmin qiymətli təsbehdən vaz keçdim. Bu gün bazara gedib bir qədər soğan aldım. Soğanları köynəyimin ətəyinə yığıb evə qayıtmaq istəyirdim ki, sənin gördüyün həmin küçədə camaatın arasında yerə töküldü. Mən əyilib soğanları yığmağa başladım və bu iş mənə çox asan gəldi. Amma soğanları topladığım vaxt gülməyimin səbəbi isə cavanlıqda təsbihimin ipinin qırıldığı və əyilib onları yığmaq mənim üçün nə qədər çətin olması idi. Halbuki o təsbihin qiyməti yüz dinar idi. Amma and olsun Allaha, bu gün yerə dağılan soğanları yığmaq mənim üçün çox asan idi. Buna görə də çox şadam".

Rəhmətlik Şeyx Məhəmməd Hüseyn mükaşifə əhli də olmuşdur. Deyilənlərə görə, bir gün İmam Hüseynin (ə) hərəmində uzun müddət səcdədən sonra seyyidüş-şühədanı görür. İmam Hüseyn (ə) ona buyurur:

Burada camaatın sıx olduğu bir yerdə uzun-uzadı səcdə etmək yaxşı deyil. Belə“ (əməlləri xəlvət yerlərdə (təklikdə) edin.”(١)

**Ayətullah Qərəvinin müstəhəbb əməllərə xüsusi diqqəti**

Ayətullah Behcət buyurur: “Rəhmətlik Kompani həyatındakı problemlərə, təhsil və tədrislə bağlı elmi məşğuliyyətlərinə baxmayaraq əksər müstəhəbb əməllərə də xüsusi əhəmiyyət verər, hətta müsafirətdə olduğu müddətdə də bu əməlləri yerinə yetirməyə çalışardı. Onun həmişəki dualarından biri bu idi: “Allahdan istəyirəm ömrünün son anına qədər bu tofiqi məndən almasın. Mən dua və namazlardan ”.mə`nəvi qida və ləzzət alıram

Ayətullah Behcət deyir: “Mən bə`zən öz-özümə fikirləşirəm ki, necə ola bilər insan bir gün də olsun “Aşura ziyarətini” oxumağı yaddan çıxarmır və namazların nafiləsini, hətta “Cə`fər Təyyar” namazını da qılır. İnsan müsafirətdə olduğu zaman necə olursa-olsun, bə`zi şeyləri həmişəki kimi yerinə yetirə bilmir. Xüsusilə də yaşlı adamın bütün bu müstəhəbb əməlləri yerinə yetirməsi müşküldür. Amma bütün bunlara baxmayaraq Ayətullah Kompani bunları ömrünün sonuna qədər davam etdirərmiş. Beləliklə, namazda səcdəyə gedərkən ruhu əbədi aləmə qovuşmağı təəccüblü (deyil”.(٢)

**...Cənab Yəhya, doğrusunu bilmək istəsən**

Höccətül-islam Seyyid Məhəmməd Rza Meybudi ustadı Seyyid Yəhya müdərris :Yəzdinin dilindən belə nəql edir

cı il ustadımız Ayətullah Ziyauddin Əraqinin vəfatına görə Nəcəf elmi hövzəsi üç-١٩۴٠ gün tə`til e`lan etdi. Bu böyük alimin xatirəsini yad etmək üçün əzadarlıq məclisləri quruldu. Bir-neçə gün keçəndən sonra Ayətullah Kompaninin evinə



---

Tövhidi elmi və eyni”, Əllamə Tehrani, səh. ٢٧-٣١“ [١٢]-١

Dər məhzəre bozorqan”, Möhsün Qərəviyan, səh. ١٣٢“ [١٣]-٢

gedib, ondan tədrisə başlamasını xahiş etdik. Ayətullah Kompani buyurdu: “Ay Seyyid Yəhya, mən qərara almışdım ki, bu gün dərsə başlayım. Amma doğrusu, sübh namazından sonra Allah zikrilə məşğul idim. Yarı yuxulu-yarı oyaq halda Ayətullah Əraqini gördüm. Evin qapısında dayanıb dedi: Şeyx Məhəmməd Hüseyn! Hazırlaş, gələn cümə günü bizim yanımıza gələcəksən. Mən ömrümün son günlərini yaşadığımı ”.yə` qin edirəm

.Belə də oldu. Həftənin son günü heç bir xəstəliyi olmadan o da dünyasını dəyişdi

.Bu haqda başqa maraqlı bir hadisəni də aşağıda qeyd edirik

Ayətullah Seyyid Mustafa Səfayi Xonsari Seyyid Məhəmməd Haşimi Gülpayqaninin dilindən belə nəql edir: “Ayətullah Kompaninin vəfat etdiyi gecə atam (Seyyid Cəmaləddin Gülpayqani) məni çağırıb dedi: Oğlum, elə indi Ziyauddin Əraqi gəlib mənə dedi ki, Ayətullah Kompani bizim yanımıza gəlir.” Dedim: Seyyid Məhəmməd Hüseyn sap-sağlam adamdır. Mən onu bir neçə saat bundan əvvəl görmüşəm. Atam dedi: Oğlum! Ağa Ziyauddin indicə gəlib bu xəbəri mənə dedi. Sən get bu barədə sorğu-sual et. Mən Ayətullah Kompaninin halını soruşmağa getmək istəyərkən, birdən mərhumun evindən şivən səsi qalxdı. Tez onun evinə getdim. Doğrudan da Ayətullah Kompani .vəfat etmişdi

Mərhum Ayətullah Şirazinin nəvəsi Seyyid Rəzi Şirazi deyir: “Rəhmətlik Ayətullah Cəmal Gülpayqani şeyx Kompaninin dəfn mərasimində dedi: Dünən axşam vətr namazının qunutunu oxuyarkən Ayətullah Əraqinin Kompaninin qolundan tutub Ayətullah Mirzə Mehdi Kəfayigilə getdiyini gördüm. Qəribə burasıdır ki, Ayətullah (Kəfayi də bir həftədən sonra vəfat etdi!(۱



---

Kəramate salehin”, Məhəmməd Şərif Razi, səh. ۲۶۷-۲۶۸ [۱۴] -۱

Allah övliyalarının həyat yolu bütün insanlar üçün gözəl nümunədir. Bu ilahi şəxsiyyətlərin həyat təcrübəsindən daha səmərəli istifadə etmək üçün onları daha yaxından tanımaq lazımdır. Bu ilahi övliyalar insanın hidayət olması üçün bir növ Allah tərəfindən əta olunan gözəl ne`mətlər sırasındadır. Dövrümüzün belə dəyərli şəxsiyyətlərindən biri də Ayətullah Behcətdir. O, başqalarına nümunə olacaq .insanlardan biridir

## İlk tanışlıq

cü ildə Qum şəhərinə gəldiyim vaxt Ayətullah Behcətlə tanış oldum. Bir il sonra-۱۹۵۳ Höccətiyyə mədrəsəsində oxuyurduq. Onun mənzili mədrəsənin yanındakı küçədə yerləşirdi. Demək olar ki, onunla hər gün yolda və hərəmdə rastlaşardıq. Nurani siması hər görənin diqqətini özünə cəlb edirdi. Gözəl xüsusiyyəti və rəftarı ilə həmişə başqalarından seçilir, bütün bunlar onun xüsusi mə`nəvi aləmdə yaşadığından xəbər verirdi. Başqalarının o qədər də əhəmiyyət vermədiyi incəliklərə o daha dəqiq yanaşardı. O cümlədən, həmişə sübh erkən durub Həzrət Məsumənin (ə) ziyarətnaməsini oxuyar və özü üçün proqramlaşdırdığı bir çox başqa müstəhəb ibadətləri heç vaxt tərk etməzdi. Bu dərin mə`nəvi əxlaqlı şəxs hər görəni valeh edərdi. Hidayət nuru sorağında olanlar üçün də gözəl nümunə idi. Onda olan bu ilahi cazibə məni də özünə cəzb etmişdi. Mən Ayətullah Behcətlə daha yaxından tanış olmaq niyyətilə onu tanıyanlardan sorğu-sual edirdim. Apardığım təhqiqat nəticəsində onun həm elmi və həm də mə`nəvi cəhətdən daha üstün olduğu mənim üçün .aydınlaşdı

Bir müddət keçəndən sonra ara-sıra onun mənzilinə gedib ibrətamiz nəsihətlərindən faydalanmaq üçün izn aldıq. Behcət o zamanlar çox kiçik bir mənzildə yaşayırdı. Pərdə ilə iki hissəyə bölünən otağın bir tərəfində

biz, o biri tərəfində isə onun ailəsi olardı. O çox sadə, amma mə`nəviyyat və nuraniyyət dolu bir həyat yaşayardı. Biz onun elmindən bəhrələnmək istəyirdik. Çünki, rəhmətlik Ayətullah Bürucerdi Qum elmi hövzəsində tədris etməyə başladığı ilk vaxtlardan dərs dediyi tələbələr arasında ən fəal və hamıdan çox sual verən Behcət imiş. Adətən, xaric dərsi tədris edən alimlərin tələbələri arasında ustadın dediyi yeni bəhsləri daha yaxşı dərk etmək üçün sual verən iki-üç tələbə tapılır. Bu tələbələr keçilən yeni bəhslər haqqında olan sualları ustada verərək dəqiq cavab tapmağa .çalışarlar

Behcət o vaxtlar Ayətullah Bürucerdinin belə fəal tələbələrindən biri idi. Əvvəllər bizi onun daha çox ruhani və mə`nəvi əxlaqı özünə cəzb etmişdi. Amma zaman keçdikcə onun elm və fiqh baxımdan böyük alimlər sırasında olduğu bizim üçün aşkar oldu. Elə buna görə də elmindən bəhrə almaq və hər gün onun ruhi mə`nəvi aləmindən istifadə .etmək istəyirdik. Bu səbəbdən də ondan bizə tədris etməsini xahiş etdik

### Ayətullah Behcətin hüzurunda

Ayətullah Behcət fiqh dərsinin təharət bölməsini bizə tədris etməyə başladı. Bir ilə yaxın Feyziyyə mədrəsəsinin hücrələrindən birində tədris etdi. Bu dərslərdə tələbələrdən bir neçəsi də iştirak edirdi. Sonralar bir-iki il də Xan mədrəsəsində tədris edən Behcət, fiziki cəhətdən zəiflədiyinə görə evdə dərs deyirdi. Təqribən, on beş il fiqhin “təharət” “məkasib” və digər bölmələrini ondan dərs aldıq. Onun dərslərindən aldığımız faydaları başqa dərslərdə ala bilmirdik. Mətləbləri bəyan edərkən əvvəl onu Şeyx Ənsarinin kitabından söyləyər, yeri gəldikdə başqalarından xüsusilə də “Cəvahir”dən, təharət bölümündə Hacı Rza Həmədanidən və digər alimlərin bu barədəki mühüm nəzərlərini də nəql edərdi. Sonra lazım gəldikdə, öz xüsusi nəzərini söyləyərdi. Ustadın bu metodu bizim eyni zamanda başqa nəzər sahiblərinin həmin mövzu haqqında olan fikirlərini öyrənməyə və vaxta qənaət etməyə kömək edirdi. Digər ustadların da tədrisdə özlərinə

məxsus şivələri vardı. Hər hansı bir alimin nəzərini ayrı-ayılıqda bəyan etmək həm vaxtın tələf, həm də bə`zi mətləblərin təkrar olmasına səbəb olurdu. Onun dərslərində qeydə aldığımız bə`zi yaddaşları özü ustadlarından şifahi mənimsəmişdi. Bu yaddaşlar .elmi baxımdan olduqca dəqiq və çox dəyərli idi

**Ayətullah Behcətin müəllimləri**

Ayətullah Behcət əsasən, fiqh dərsini Mirzə Məhəmməd Təqi Şirazinin şagirdi Şeyx Məhəmməd Kazim Şirazidən dərs almışdı. Üsul dərsini isə rəhmətlik Ayətullah Naininin, sonra isə Ayətullah şeyx Məhəmməd Hüseyn Kompani İsfahaninin yanında oxumuşdu. Daha çox Ayətullah Kompanidən dərs almış, əxlaqi cəhətdən də bu ustadın ona mühüm tə`siri olmuşdu. Bə`zən ustadından eşitdiyi mətləbi qəribə bir tərzdə bəyan edər və onun nümunələrini biz Behcətin rəftarında görərdik. Bu ustadın (Kompani) onun mə`nəvi formalaşmasında da böyük rolu olduğu aşkar gözə çarpırdı. Çox yaxşı yadımdadır ki, Ayətullah Behcət həmişə deyərdi: "Rəhmətlik Şeyx Məhəmməd Hüseynin (Kompani) elmi fəaliyyətlərinə diqqət edən hər bir şəxs onun gecə-gündüz mütaliə və tədqiq işlərindən başqa heç bir iş görmədiyini güman edər. Amma onun ibadi proqramlarından xəbərdar olsaydılar, ibadətdən başqa bir işi olmadığına əmin olardılar. Elmi fəaliyyətlərə olduqca məs`uliyyətli idi. Hətta bu barədə belə nəql edirlər: Mən (Kompani) on üç il "Kifayə" kitabının müəllifi rəhmətlik Axund Xorasanidən dərs almışam. Bu on üç il ərzində cəmi bir dəfə onun dərsinə gedə bilmədim (gecələr tədris edərmiş). Onun da səbəbi bu idi ki, Kazimeynə ziyarətə getmişdim. Qayıdarkən bir müşkül ortaya çıxdı. Elə buna görə də vaxtında dərsə çata bilmədim. Yolda qayıdarkən ustadın bu gecə hansı dərsi deyəcəyini zənn etdiyim üçün qabaqcadan həmin mətləbi yazdım. Nəcəfə qayıdandan sonra dostlarımdan dərs haqqında soruşanda mə`lum oldu ki, mənim qabaqcadan yazdığım mətləbi ustad .bəyan edibmiş

Elmi baxımdan belə yüksək məqam sahibi olmasına baxmayaraq (ustadın deyəcəyi yeni dərsi qabaqcadan bilmək), dərslərinə qarşı olduqca məs`uliyyətli idi. Şeyx ".Məhəmməd Hüseyn İsfahani on üç il tamam rəhmətlik Axundun yanında dərs aldı

Onun elm sahəsində çox mühüm fəaliyyətləri olmuşdur. O cümlədən, "Kifayə" və Şeyxin "Məkasib" kitablarına yazdığı haşiyələr daha dəqiq və dərin haşiyələrdən hesab olunur. Adi adamların bə`zən ۵۰-۶۰ yaşına qədər müvəffəq olmadıqları bu elmi işi o, ۲۷ yaşına qədər yazıb qurtarmışdı. Bütün bunlar Ayətullah Behcətin öz ustadı haqqında .nəql elədikləridir

**Ayətullah Qərəvi və ibadət**

:Ayətullah Behcət bu barədə belə nəql edir

Ayətullah Qərəvi mühüm elmi fəaliyyətləri ilə yanaşı ibadətə də çox əhəmiyyət" verərdi. Kənardan baxana elə gələrdi ki, onun ibadət etməkdən başqa bir işi yoxdur. Hər gün "Aşura" ziyarətnaməsini oxumaq və "Cə`fər Təyyar" namazı qılmaq onun gündəlik və adi proqramlarından idi. Nəcəf alimləri arasında olan adətə görə həftənin hər cümə axşamı və ya cümə günü "rövzə" məclisi qurulardı. Belə məclislər bir növ ustadların, tələbələrin və dostların görüşməsinə şərait yaradırdı. Şeyx Məhəmməd Hüseyn İsfahani bu məclislərdə çay vermək və ayaqqabıları səliqəyə salmaq işlərini həmişə öz öhdəsinə götürərdi. Ayaqqabıları səliqəyə sala-sala dodaqaltı hansısa zikri zümzümə edər və çox tez-tez dediyindən biz onun hansı zikri dediyini başa düşməzdik. Bizə çox maraqlı idi ki, görən bu hansı zikrdir və ayaqqabıları düzəldərək onu təkrar edir. Günlərin birində onun yaxın dostlarından olan şeyx Məhəmməd Əli Bürucerdi Qərəvidən soruşur: Bu nə zikrdir ki, ona bu qədər əhəmiyyət verirsiniz? Hətta salam verib hal-əhval tutanda da diliniz bu zikrdən dayanmır? O gülümsünüb deyir: Çox ".yaxşıdır ki, insan hər gün min dəfə "Qədr" surəsini oxusun

səh:۲۷

Bəli, Behcət elə ustadlardan dərs almışdır. Onlar elmi fəaliyyətləri müqəddəs saymaqla namaz, ziyarət və dualara da böyük əhəmiyyət verərdilər. Bir çox böyük ustadların, o cümlədən Naininin yanında əxlaq dərsi alsa da, Behcətin əxlaqi və mə`nəvi formalaşmasında xüsusi rol oynayan ustadı hacı Mirzə Əli Qazi olmuşdur. Rəhmətlik Əllamə Təbatəbai, Şeyx Məhəmməd Təqi Amuli, Şeyx Əli Məhəmməd Bürucerdi, digər böyük alimlər və hətta mərcəi-təqlidlərdən bir çoxu onun bu dərslərindən faydalanmışlar. Tez-tez yad etdiyi ustadlardan biri də rəhmətlik Şeyx .Mürtəza Taliqani idi

## Ayətullah Behcətin şəxsiyyətində müxtəlif cəhətlər

Yuxarıda qeyd etdiyimiz kimi Behcət elmi və mə`nəvi cəhətdən üstün olan böyük ustadlardan dərs almışdır. Bütün bunların onun hərtərəfli formalaşmasında əvəzsiz tə`siri olmuşdur. Mə`nəviyyata daha çox ehtiyac duyulan bir zamanda Behcət kimi şəxsiyyətlər Allahın insanlara bəxş etdiyi böyük ne`mətlərdən sayılır. Onun bərəkətli ömrünün hər anından səmərəli istifadə edərək, belə gözəl ne`mətlərə görə Allaha .həmd etməliyik

Allah-təala ona xass xüsusiyyət və zati iste`dad əta etmişdir. O fövqəladə iti zehnə malik bir insandır. İstər fərdi və ictimai, istərsə də siyasi məsələlərə özünəməxsus uzaqgörənliklə yanaşır. Elmi-ibadi işlərə qərq olan bir şəxsin belə dəqiq məsələlərə olan diqqəti və onu gözəl dərk etməsi, çoxlarına təəccüblü gəlir. Behcəti ibadət və ya tədris halında görən hər bir şəxs, onun siyasi-ictimai məsələlərə çox əhəmiyyət vermədiyini fikirləşər. Onu da qeyd edək ki, məni (Misbah Yəzdi) ictimai-siyasi məsələlərə əhəmiyyət verməyə təşviq edən şəxs Ayətullah Behcət olmuşdur. Tədris etdiyi vaxtlarda öz tələbələrinə bu haqda sifariş edib deyərdi: Elmi-mə`nəvi məsələlərə e`tiqadı olan hər bir şəxs siyasi-ictimai məsələlərə də ciddi yanaşmalıdır. Əks təqdirdə bir gün gələr cəmiyyətin siyasət işləri səriştəsiz insanların əlinə düşə bilər və islam cəmiyyətini azğınlığa sürükləyər. Hətta İmam Xomeyniyə də siyasi

məsələlər barədə xüsusi sifarişlər edərdi. Bir dəfə də İmam Xomeyniyə göndərəcəyi .belə sifarişlərdən birini çatdırmağı dostlardan biri ilə mənə tapşırmışdı

### İxtiyari ölüm məqamı

İmam Xomeyninin Behcətə xüsusi rəğbəti vardı. Mən bunu bilavasitə onun özündən eşitməmişəm. Çünki ustadları suallarımla zəhmətə salmağı özümə icazə verməzdim. Sizə nəql edəcəyim bu xatirələrin bə`zisini özüm şəxsən müşahidə etmiş, bə`zilərini də ustadların özləri buyurmuşlar. Rəhmətlik hacı Mustafa (İmam Xomeyninin oğlu) onun haqqında İmam Xomeyninin dilindən belə nəql edirdi: İmam Xomeyninin rəhmətlik Bürucerdi ilə get-gəl etdiyi vaxtlar idi. Behcətin olduqca sadə və kasıb yaşadığını bilən İmam Xomeyni onun ailəsinə kömək etmək niyyətilə Ayətullah Bürucerdidən bir miqdar pul alır. Məsələnin nə yerdə olduğunu bilən Behcət pulu götürməkdən boyun qaçırır. İmam Xomeyni aldığı pulu bir də geri qaytarmaq istəmədiyi üçün ona deyir: Bu pulu mən öz malımdan sənə verirəm. Behcət bu pulu İmam Xomeyninin hədiyyəsi kimi qəbul edir. İmam Xomeyni ilə yaxın dost olan cənab Məs`udi nəql edirdi ki, İmam Xomeyni bə`zən çətin vaxtlarda və ya evdə xəstəsi olanda məni Behcətin yanına göndərərdi. Belə vaxtlarda bə`zən Behcət qurbanlıq kəsməyi tövsiyə edərdi. Bir neçə dəfə Behcətin sifarişi ilə İmam Xomeyninin tərəfindən qoyun alıb qurbanlıq kəsmişəm. İmam Xomeyni onun böyük mə`nəvi məqam sahibi olduğunu təsdiqləyirdi. İmam Xomeyninin dediyinə görə, Behcət ixtiyari ölümə malik idi. Yə`ni istədiyi vaxt ruhunu bədəndən çıxarır və yenidən geri qaytara bilir. Bu ilahi şəxsiyyətlərin mə`nəviyyat yolunda ələ gətirdikləri böyük məqamlardan biridir. Allah övliyalarının ələ gətirdikləri elə ali məqamlar vardır ki, onu hətta düzgün .dərk etmək belə bizim üçün çox çətindir

səh:۲۹

## Allah–təalanın Behcətə xüsusi mərhəməti

Ayətullah Behcətin fövqəladə kamal sahibi olduğuna e`tiqadı olan şəxslərdən biri də əxlaqi və irfani məsələlərdə rəhmətlik Qazinin canişini Şeyx Abbas Quçani idi. Şeyx Abbas Quçaninin oğlu Şeyx Mahmud Quçani atasının dilindən belə nəql edir: "Behcət çox cavan yaşlarında ilahi məqama çatmışdı. Mən onun yaxın dostu olduğuna görə bunları bilirdim. Amma mən Behcətə söz vermişdim ki, onun sağ olduğu müddətdə bu sirri heç kimə açmayım. Həmin vaxtlar təqribən, ۱۷-۱۸ yaşlarında olan Behcət belə ".böyük məqama çatmışdı

Mənə elə gəlir, həmin "ixtiyari ölüm" məsələsini deyirdi. Uzun illər Allah yolunda xalis bəndəlik edən bir şəxs əgər ۲۰ yaşından əvvəl "ixtiyari ölüm" məqamına çatarsa, onun ۸۰ yaşında hansı ilahi dərəcəyə çatdığını güman etmək olar. Behcətin bu mə`nəvi xüsusiyyətləri hər mö`min şəxsin diqqətini özünə cəlb edir. Əlbəttə, nəql etdiyimiz .bütün bunlar böyük şəxsiyyətlərin kamal dəryasından bir damladır

## Behcətə xass əlamətlər

Öz mə`nəvi məqamını başqalarından gizlətmək Behcətə xass olan xüsusiyyətlərdən biridir. Çox nadir hallarda müqabilindəki şəxs onun danışıqlarından və ya rəftarından bu insanın xariqüladə olmasını başa düşərdi. Onunla yalnız uzun illər yaşamış yaxınları onda gözə çarpan o əlamətləri qəti olaraq hiss etmişlər. Onun yanında dərs aldığımız vaxtlar, adətən biz (Misbah Yəzdi) hamıdan qabaq dərsə gələr və bir neçə dəqiqə ustadın əxlaqi söhbətlərindən faydalanardıq. Adətən, dərsə başlamazdan qabaq müxtəlif yollar və çox vaxt da dolayısı ilə bizləri nəsihət edərdi. Söhbətini həmişə bir tarixi hekayə ilə başlayar, nəql etdiyi tarixi əhvalatlar bizim ötən gündəki rəftarımızla çox bağlı olardı. Sanki, bütün dedikləri bizə aid idi. Rəftarımızda olan nöqsanı bir hədis və ya bir şəxs barəsində olan tarixi əhvalat vasitəsilə bizə bildirərdi. Bu dediklərimi başqaları da təsdiq edib deyirdilər ki, biz də eyni

şeyləri öz həyatımızda təcrübə etmişik. Behcət qarşı tərəfin ehtiramını gözlədiyi üçün, onun səhvini birbaşa üzünə deməyib, sözünü dolayısı yolla çatdırardı. Çox vaxt onun nəql etdiyi hədislərdə hər kəs öz nöqsanını başa düşər, bu nəsihətin ona da aid .olduğunu hiss edərdi

Qırx beş-qırx altı il bundan əvvəl Behcətlə tanış olandan onun gündəlik xüsusi sübh proqramı var idi. O hər gün sübh azanından gün çıxana qədər Həzrət Məsumənin (ə) hərəmində ibadətlə məşğul olar və gündəlik "Cə`fər Təyyar namazı"nı qılardı. Axşam çağı gün batmazdan əvvəl piyada gəzişərək "Səfaiyyə" məhəlləsinə tərəf gedərdi. Axşam namazını Səfaiyyə ətrafındakı əkin sahələrinin kənarında–təbiətin qoynunda qılardı. Onu görmək istəyən dostlardan bə`ziləri namazlarını Behcətlə birgə qılar və .onun namazdakı qəribə halını müşahidə edərdilər

Dostlardan biri belə nəql edir: Bir dəfə Behcət şam namazını qılandan sonra buyurdu: "Əgər yer üzündəki bütün padşahlar insanın ibadətdən necə ləzzət aldığını bilsəydilər, ".heç vaxt maddi ləzzətlər dalınca getməzdilər

Uzun illər kirayənişin yaşayan Behcət hal-hazırda da çox kiçik və sadə evdə yaşayır. Əhli-beyt yolunda olmaq və şər`i qayda-qanuna (ədəb-ərkan) olan xüsusi diqqəti Behcətin tərbiyəvi üsulundakı mühüm xüsusiyyətlərdən biridir. Şər`i ədəb-ərkan və Əhli-beyt yolunda olmaqda hamı eyni səviyyədə deyildir. Amma Behcətin öz həyat tərzində və rəftarında bu məsələlərə çox dəqiq yanaşdığı açıq-aşkar özünü büruzə verir. Hətta öz rəftarında elə incəliklərə diqqət edir ki, bunları vəsf etmək belə çox çətindir. Ata yurdundan irs olaraq ona kiçik bir mülk (torpaq sahəsi) çatmışdı. Bu torpaq sahəsində əkilən çəltik (düyü) ailəsinin illik düyü payının çox az bir hissəsini tə`min edirdi. Həmin mülkdə əkilən düyüdən qonşulara və yaxın dostlara az da olsa .pay verməyi heç vaxt yaddan çıxarmazdı

İnqilab vaxtı baş verən bə`zi hadisələrə görə yaxın dostlarımdan bir neçəsi şahın adamları tərəfindən həbs olunmuşdu. Ələ keçən mühüm sənədlər arasında mənim (Misbah Yəzdi) öz xəttimlə yazılmış bir neçə kağız

da var idi. Dostların məsləhəti ilə bir müddət Qum şəhərindən çıxmalı oldum. Müsafirətdə olduğum vaxtlar hətta yaxın adamlarım belə mənim harada olduğumu doğru-düzgün bilmirdilər. Ailəmin yanında olmadığım müddətdə bir dəfə Behcət bir kisə düyü və bir miqdar pulu oğlu ilə xanımına verib bizim evə göndərmişdi. Oğlu küçənin başında durur və Behcətin xanımı düyü ilə pulu mənim ailəmə çatdırır. Mən bunu eşidəndə, əvvəl çox təəccüblənmişdim. Amma Quma qayıdandan sonra başa düşdüm ki, Behcət şər`i adət-ən`ənəyə çox əhəmiyyət verdiyinə görə mən evdə olmadığım vaxt öz xanımını bizim qapıya göndəribmiş. Şər`i qayda-qanuna görə əri müsafirətdə olan qadının qapısına naməhrəm şəxsin getməsi düzgün deyil. Ona görə də oğlu küçənin başında durubmuş ki, bu şər`i məsələyə riayət olunsun. Onun o vaxtı ailəm üçün göndərdiyi pul elə də çox deyildi. Amma o öz imkanı daxilində və şər`i .qayda-qanuna dəqiq riayət edərək həmin əmanətləri bizim evə çatdırmışdır

Allah övliyalarının rəftar və danışıqda incəliklərə dəqiq riayət etməklərini bilməkdən .əlavə, onları doğru-düzgün başa düşmək üçün insana böyük elm lazımdır

### Höccətül–islam Fehri ilə müsahibə

#### Birinci əhvalat

.Ayətullah Behcət haqqında xatirələrimdən bir-neçəsini burada sizin üçün nəql edirəm

Nəcəf-Əşrəfdə olduğum vaxtlar Ayətullah Behcətin mə`nəvi məqamları barəsində çox eşitmişdim. Qum şəhərinə gələndə onu görmək arzusunda idim. Evləndikdən sonra təsadüfən onunla qonşu olduq. Bacardığım qədər onun camaat namazlarında .iştirak etməyə çalışırdım

Günlərin birində "mehrab şəhidi" Ayətullah Dəstğeyb bizim Qum şəhərindəki evimizə gəlmişdi. Təsadüfən həmin gün Ayətullah Behcət də bizə gəldi. Behcətin başqalarıyla çox get-gəl etmədiyini bildiyimə görə, onun bu gəlişi məni çox təəccübləndirdi. Bu böyük şəxsiyyətin hər ikisi rəhmətlik Şeyx Kazim Şirazinin tələbələrindən olmuşlar. Səmimi salamlaşıb-görüşəndən sonra Behcət oturub zikr deməyə məşğul oldu. Şəhid Dəstğeyb onunla üz-üzə əyləşərək sükut ixtiyar etmişdi. Təqribən on dəqiqədən sonra .Behcət sağollaşıb getdi

Şəhid Dəstğeyblə söhbət əsnasında onun mə`nəvi kamal və məqamları barəsində danışdıq. Ayətullah Dəstğeybdən soruşdum: Behcətin Nəcəfdə olduğu vaxtlarından hansı xatirə yadınızdadır? Ayətullah Dəstğeyb buyurdu: "Behcətin mə`nəvi məqamları barəsində danışmağa biz çox acizik. Amma Behcətlə öz haqqımda olan bir hekayəni sizin üçün nəql edərəm. Bir gün Nəcəfin tanınmış və böyük fəqihlərindən olan Şeyx Kazim Şirazinin dərsindən sonra Behcət ustada dedi: Dünən axşam bir yuxu görmüşəm. Əgər izin versəniz, sizin üçün bu yuxunu danışardım. Şirazi soruşdu: Yuxuda kimi görmüsən? "Dəstğeybi" – deyə Behcət cavab verdi. Ustad icazə verdikdə o, belə ərz etdi: Yuxu aləmində Dəstğeybin Nəcəfdən Şiraza getdiyini gördüm. Onun Şiraza gəlişi islam və şiənin daha da güclənməsinə səbəb olur. Şiraz əhalisi üzərində "La ilahə illəllah, Məhəmməd rəsuləllah, Əliyyən vəliyyullah" yazılmış plakatlarla onu qarşılamağa çıxmışdılar. Şirazda böyük müvəffəqiyyətlər qazanır və oranın alimləri onun camaat namazında iştirak edirlər. Camaat arasında bir günəş kimi nur saçan .Ayətullah Dəstğeybin bərəkətli vücudundan hamı istifadə edir

Behcət yuxusunu danışıb qurtarandan sonra Şeyx Kazim Şirazi mənə xitab edərək dedi: “Ağa Dəstğeyb! Mən sizə elə günü bu gün Şiraza getməyi əmr edir və Nəcəfdə ”.qalmağınızı haram bilirəm

Bu elə bir vaxtda idi ki, mən Nəcəfə Həzrət Əlinin (ə) hərəminin kənarında həmişəlik qalmaq üçün getmişdim. Şiraza qayıtmaq fikrim belə yox idi. Hətta dünyadan köçərkən məni Nəcəfdə basdırmağı da vəsiyyət etmişdim. Amma şər`i hakimin hökmünə əməl etmək vacib olduğu üçün ailəmlə birlikdə Şiraza qayıtmağa hazırlaşdıq. Behcətin dediyi kimi, camaat bizim Şiraza gəlişimizi çox yaxşı qarşıladı. Namaz qılmaq üçün şəhərin “Came” məscidinə getdik. Şirazın alimləri məscidə yığılıb mənimlə birgə namaz qıldılar. Beləliklə, mən Şirazda qalıb öz dini-təbliğati fəaliyyətlərimi davam ”.etdirdim

Bəli! Böyük fəqih Şeyx Kazim Şirazi Ayətullah Behcətin yuxusunun sadiq olduğunu bilərək, elə buna əsasən, şər`i hökm vermişdir. Amma Dəstğeybə gəldikdə isə, Ayətullah Behcətin yuxuda gördüklərinin hamısı çin oldu. O, Şirazda elmilə böyük ad-san qazandı. Köməyə ehtiyacı olan insanlar onun yanından heç vaxt əli boş .qayıtmazdılar

### İkinci əhvalat

İnqilabdan əvvəlki illərdə atam həmişə “Darüs-səlam” məscidində (Tehran) pişnamaz olardı. Bir gün atam zəng edib dedi ki, bir müddət onun yerinə məsciddə camaat namazı qılım. Mən üzürxahlıq edib dedim: Qumdan Tehrana gəlib bir-iki həftə qalmaq mənim üçün çox çətindir. Amma atam da Tehrana gəlməyimi tə`kid edirdi. Atam narazı olduğumu başa düşüb dedi: Əgər belədirsə, get Behcət istixarə etsin. Behcəti görmək üçün “Fatimiyyə” məscidinə getdim. Namaz qurtarandan sonra onunla salamlaşıb halını soruşdum. Mənim üçün istixarə etməsini xahiş etdim. Behcət istixarə .etmədən dedi: Valideynin sözünə itaət etmək vacibdir

Mən təəccüblə dedim: Hər halda istixarə etməniz yaxşı olardı. Qur`anla istixarə edib ”.dedi: “Elə mən deyəndir

Heç kəsin bilmədiyi bu məsələdən onun xəbərdar olması mənim üçün çox təəccüblü idi. Bu əhvalatı atama nəql edərkən o dedi: Belə məsələlər Behcət üçün çox sadədir. Allah rizasına görə qırx-əlli il riyazət çəkən bir şəxs üçün belə şeyləri bilmək o qədər də .çətin deyil

### Üçüncü əhvalat

İnqilabdan əvvəlki illərdə evimi dəyişmək qərarına gəlmişdim. Bu, Behcətlə Ayətullah Dəstğeybin qonaq gəldiyi həmin ev idi. İstixarə etmək üçün Behcətin mənzilinə getdim. O, dəstəmaz alırdı. Dəstəmaz alıb qurtarandan sonra elə həmin dəqiqə belə dedi: "Evi satmayın. Çünki Həzrət Məsumənin (ə) hərəminin yanında xüsusi bərəkət ".vardır. Oradan uzaqlaşdıqca həmin bərəkətdən də uzaq olacaqsan

Sanki, mən istixarə üçün xahiş etməzdən əvvəl onun bu məsələdən xəbəri vardı. Mən Behcətə dedim: Elə bu məsələyə görə sizin yanınıza gəlmişəm. Bir nəfər mənim mənzilimi almaq istəyir. Xahiş edirəm buna görə bir isitixarə edəsiniz. Mənzil şərikli olduğundan, şərik öz payını (səhmini) satmaq istəyir və bir nəfər evi almağa hazırdı. Amma mən evi bu adama və yaxud başqasına satmaqda tərəddüd edirəm. Çünki onun pulunun halal olmadığı barədə bə`zi şeylər eşitmişəm. Behcət istixarə edib dedi: "Bu işi ".görməyin, çünki çox kərahəti var

Elə buna görə də evi həmin şəxsə satmadım. Bir müddət keçəndən sonra möhtərəm bir şəxs evi almaq üçün gəldi. Borcumu ödəmək və şərikimin səhmini vermək üçün evi .həmin şəxsə satdım

### Dördüncü əhvalat

E`timadlı dostlardan biri belə nəql edirdi: "Bir gün Behcətin həmişə namaz qıldığı məscidə tərəf gedəndə, onun məscid qapısından çölə çıxdığını gördüm. Onun salamatçılığına astadan salavat göndərdim. Behcətə yaxınlaşıb əlini öpmək istəyəndə, ".dedi: Sizə minnətdaram

Sonda xülasə şəkildə ərz edirəm ki, Behcətin hədəfi dinə, şiəliyə, irfana və Əhli-beytə (ə) xidmətdir. Mən onu mə`sumlarımızın davamçısı hesab edirəm.(١)

**Məşhəd dini–elmi hövzəsinin böyük ustadlarından Məhəmmədi ilə müsahibə**

(٢)

Sual: Müsahibəyə razılıq verdiyiniz üçün sizə minnətdaram. Bildiyimizə görə siz uzun illər Behcətdən dərs almısınız. Xahiş edirik onun şəxsiyyəti barəsində xatirənizdə olan maraqlı hadisələri bəyan edəsiniz.

Cavab: Bismillahir-rəhmanir-rəhim. Böyük alimlərin mə`nəvi məqamları haqqında (kitab) yazdığınıza görə sizə öz minnətdarlığımı bildirirəm. Behcət barəsində bir neçə mövzuda danışmaq olar:

**Xüsusiyyətləri**

Əhli-beytə saxlanılan rövzə məclislərinə Ayətullah Behcətin xüsusi rəğbəti vardı. Bu məclislərdə özü əvvəldən axıradək qalardı. Məşhədin rövzə məclisləri çox uzun çəkərdi. Bir gün Ağa Behcətə dedim: Sizin üçün çox çətindir. Çalışın məclislərə sonuna yaxın gəlin. Behcət buyurdu: “Yuxuda mənə dedilər ki, rövzə məclislərinə çox get”.

Bir gün Behcətlə tək olanda dedim: İcazə verirsinizmi bir rövzə oxuyum? Dedi: “Bəli”.

Rövzə qurtarandan sonra buyurdu: “Mirzə Məhəmməd Təqi Şirazinin həmişə həm ümumi, həm də xüsusi rövzə məclisi olardı. Xüsusi məclisdə bir nəfər təklikdə ancaq onun üçün rövzə oxuyardı.



---

١- [١۵] “Nüktehaye nab əz Ayətullah Behcət”, Rza Baqirzadə, səh. ١١٠-١١۶

٢- [١۶] Ağa Məhəmmədi hal-hazırda Məşhəd dini elmi hövzəsində fiqh və üsul dərslərini tədris edir və Məşhədin tanınmış xətib və vaizlərindən sayılır.

Behcətin hərəmə getməsi və orada oxuduğu dualar çox maraqlıdır. Evdən çıxıb hərəmə gedərkən “təqibatı” oxumağa başlayar və həmişə bu duanı zümzümə edərdi: “Allahummə inni əs`əlukə xəyrə umuri kulliha və əuzu bikə min xizyid-dunya və ”əzabil-axirə

Bu duadan sonra “Nas”, “Tövhid”, “Fələq”, “Kafirun” surələrini oxuyar, “Məfatih”dən günəşin çıxmasından əvvəl və sonrakı duaları zikr edərdi. Hərəmin həyatində dəfn olunan alimlər, o cümlədən rəhmətlik Valeh, Əbuturabi, Şeyx Bəhayi, Höccət və .başqaları üçün fatihə oxuyar

Darüz-zöhd”də İmam Rzanın (ə) məxsus ziyarətnamə və dualarını zikr etməyə“ məşğul olar, həmişə dua və zikr dediyi vaxtlarda gözlərini yumar, camaat da onun ətrafına toplaşıb tamaşa edərdi. Amma Behcətin uzun müddət bu halda qalmasından yorulub, oradan dağılışardılar. Sonra pak zərihin qarşısında gözlərini yumub dua .zümzümə edərdi

Bir gün ondan bu halda (gözlərini yumub) dua oxuması barədə soruşanda belə cavab verdi: “Belə halda fikrimi daha yaxşı toplaya bilirəm.” (Əvvəllər bel və diz ağrıları olmayanda ayaq üstə saatlarla dua və zikr deməyə məşğul olardı. Onun yanında olanların çoxu, hətta cavanlar da yorulardı. Amma Behcət ayaq üstə yorulmaq (.bilmədən davam edərdi

Rəhmətlik ustadları və dostları üçün “Əminəllah” ziyarətini oxuduqdan sonra Cə`fər Təyyar namazını qılar, namazdan sonra mərhum Məclisinin “Zadül-məad” kitabında çox tövsiyə olunmuş duanı və hərəmdən evə qayıdarkən həzrət Əlinin (ə) Səbah” .duasını zikr edərdi

Bir gün yolda gedərkən iki dəfə ona sual verdim. Behcət buyurdu: “İki dəfə “Səbah” ”.duasını oxumağa başladım, hər ikisində də duamı yarımçıq kəsdin

Günlərin biri İmam Rzanın (ə) hərəmində bir tələbə ondan bir sual soruşur. Behcət tələbənin sualına cavab verir. Tələbə ikinci dəfə soruşanda o deyir: “Mən özüm ?İmamın qapısına dilənməyə gəlmişəm. Niyə qoymursunuz rahat dilənim

Bir gün Ayətullah Mirvaridin mənzilində olduğumuz vaxt Ayətullah Behcət buyurdu: .١ “Rəşt şəhərinin xətiblərindən biri belə nəql edirdi: Minbərə qalxarkən əvvəl İmam Hüseynə (ə) salam verirəm. Əgər salamımın cavabını versə, moizəmi davam edirəm. Amma cavab eşitməsəm, məclisdə olanlardan üzürxahlıq edib oranı tərk edirəm. Bir nəfər ondan (Ayətullah Mirvarid) bu məqama necə çatması barədə soruşanda, belə cavab verir: Bir dəfə bir məclisə moizə etmək üçün iki nəfər də\`vət etmişdilər. Həmin iki nəfərdən biri də mən idim. O biri şəxs məndən əvvəl minbərə çıxıb moizə etməyə başladı. Öz-özümə dedim: Gərək elə söhbət edəm ki, onun danışdıqları heç ola. Amma mən öz nəfsimlə mübarizə aparıb qırx gün minbərə çıxmadım. Əvəzində isə Allah-.təala mənə bu kəraməti bəxş etdi

Behcət buyurur: “Rəşt tacirlərindən biri Məşhəd sakini idi. Rəştdən Məşhədə gələn .٢ başqa bir tacir onun evində qalırdı. Bir gün ev sahibi pəncərəni açıb İmam Rzaya (ə) salam verəndə, qonağın yeniyetmə oğlu İmamın cavabını eşidir. Oğlan təəccüblə ev sahibinə deyir: Mən sizin salamınızın cavabını eşitdim. İmam sizin salamınıza cavab verir? Ev sahibi deyir: Bəli. Səndə onu eşitmək iste\`dadı olduğu üçün İmamın cavabını ”.eşitdin. Doğrusu İmam Rza (ə) hamının salamına cavab verir

Behcət belə nəql edirdi: “Şeyx Əli Zahid olduqca imanlı və zahid bir şəxs idi. Çörəyini .٣ həmişə özü bişirərdi. Bir dəfə Kərbəla ziyarətinə gedən Şeyx Əli Zahid bir neçə gün orada qalmalı olur. Bir gün bir şəxs ona yaxınlaşıb çörək istəyir. Şeyx deyir: Əgər çörəyimi sizə versəm gərək tezliklə Kərbəlanı tərk edəm. (Çünki başqa çörəklərdən ”(.istifadə etməzdi

Ayətullah Behcət buyurur: “Ayətullah Şərəbyani böyük alimlərdən biri idi. Soyuq qış .۴ günlərinin birində bir dilənçi ondan kömək istəyib, deyir: Əgər kömək etməsən acından öləcəyəm. Amma Şərəbyani onun dediklərinə əhəmiyyət vermir. Dilənçi mənzilinin qapısına qədər onun dalınca gəlir. Şərəbyani evə girib qapını bağlayır. Onun fəqirə əhəmiyyət vermədiyinə

görə evdəkilər də bir söz demir. Səhər dilənçinin qapının ağzında öldüyünü görürlər. Ayətullah Şərəbyani ona qüsl verməyi tapşırır. Paltarlarını çıxaranda, onun cibindən içi ".dolu pul kisəsi tapılır

Bir nəfər Şeyx Cə`fər Şüştərinin yanına gedib deyir: Uşağımın gözləri kordur. Siz .۵ "Həmd" surəsini oxuyun, övladımın gözləri açılsın. Şeyx dedi: Atam olan yerdə mənim oxumağım yaxşı deyil. Get atamın yanına. Uşağı Şeyx Cə`fərin atasının yanına aparır. O əlini uşağın gözləri üstünə qoyub Həmd surəsini oxuyur. Elə bu vaxt uşaq deyir: (Barmaqların arasından) Görürəm. O, Həmd surəsini oxuyub qurtaranda, uşaq artıq .görürdü

İsfahan alimlərindan Muniri rəhmətlik Mirzə Şiraziyə irad tutur və bu barədə məktub .۶ yazıb İsfahan alimlərindən də imza toplayır. Məktubu sahibinə (Mirzə Şirazi) çatdırmaq üçün Nəcəf-Əşrəfə yollanır. Əvvəlcə mərhum Molla Fəthəli Sultanabadinin görüşünə gedir. Rəhmətlik Sultanabadi ona cibindəki məktubun məzmunundan xəbər verəndə çox təəccüblənir. Özünü başqalarından üstün bilən bu şəxs təvazökarlıqla Molla Fəthəliyə deyir: Bizə bəhrələnmək üçün bir şey deyin. Sultanabadi buyurur: Siz özünüz :böyük alimsiniz. O çox israr etdikdə, Molla deyir: Üç şeyə həmişə əməl et

.Ayın əvvəlinin xüsusi namazını qıl .۱

.Hər gün "Aşura" ziyarətini oxu .۲

Hər axşam iki rəkət Vəhşət namazı qılıb kimsəsiz mö`min bacı-qardaşların ruhuna .۳ (hədiyyə et."(۱

**Oğurlanmış gəlindən xəbər**

Toy günü bir ailə üçün bədbəxt hadisə baş vermişdi. Qız evi ilə düşmən olanlar gəlini oğurlamış və hara apardıqlarından heç kimin xəbəri yox idi. Gəlinin ata-anası və oğlan evi çox nigaran idilər. Yaxın qonşulardan biri bu iki ailənin narahatçılığını görüb .Behcətin yanına gedir və baş verənlərin hamısını ona danışır

Behcət bir az fikirləşdikdən sonra çox adi tərzdə deyir: “Gedin hərəmə, bəlkə ora getmiş ola.” O, çox arxayın olduğundan gəlinin ailəsinə xəbər verir ki, hərəmə getsinlər. Hərəmə gələndə qızı Həzrət Mə`sumənin (ə) zərihinin yanında olduğunu .görürlər. Gəlinin belə bir yerdə tapılacağı isə heç kimin ağlına da gəlməzdi

**”Oğlunun adını Məhəmmədhəsən qoy“**

Dostlardan biri belə nəql edirdi: Mənim həyat yoldaşım hamilə idi. Ramazan ayından qabaq müsafirətə getmək istəyirdim. Ayətullah Behcətlə sağollaşmaq üçün onun mənzilinə getdim. O, mənim üçün dua edəndən sonra dedi: “Allah-təala bu ayda sizə ”.bir oğlan uşağı nəsib edəcək. Adını Məhəmmədhəsən qoyarsınız

Mən ona həyat yoldaşımın hamilə olması barədə heç bir şey deməmişdim. Ona görə də uşağın oğlan olacağından xəbər verməsi mənim üçün çox təəccüblü idi. İmam Həsənin (ə) təvəllüdü gecəsi– yə`ni ramazan ayının ۱۵-də Allah-təala bizə bir oğlan .uşağı əta etdi ki, Ayətullah Behcət qabaqcadan adını Məhəmmədhəsən qoymuşdu

**Şeyx Mürtəza Taliqanini yad edərkən**

Ayətullah Behcətin bəhrə aldığı ustadlardan biri də Şeyx Mürtəza Taliqani olmuşdur. .Burada bu böyük alimin həyatından qısa mə`lumat verməklə kifayətlənirik

İlahi arif Şeyx Mürtəza Taliqani Nəcəfi ۱۸۴۷-cü ildə Taliqan şəhərinin Dizan kəndində dünyaya göz açmışdır. Yazıb-oxumağı doğulduğu kənddə öyrəndikdən sonra “müqəddəmat” dərslərinin təhsilinə başlayır. Tehrana hicrət edəndən sonra “müqəddəmat və səth” dərslərini orada başa vurur. Əqli dərsləri–yə`ni fəlsəfəni Tehranda oxumağa başlayan Şeyx Taliqani bu elmlərə daha dərindən yiyələnmək üçün iki böyük alim, arif Axund Molla Məhəmməd Kaşi və Cahangirxan Qaşqayinin dərslərinə qatılır. O fiqh elmini

öyrənmək üçün dövrünün böyük ustadlarından, o cümlədən Nəcəfi Məscidşahi İsfahani, Seyyid Məhəmməd Baqir Dərəçeyi, Əllamə Gəzi və Şeyx Mürtəza Dizi .İsfahanidən dərs almışdır

cı ildə Nəcəf-Əşrəfə hicrət edən Şeyx Mürtəza Taliqani, Mühəqqiq Xorasani, -۱۸۸۰ "Ürvətül-vüsqa" kitabının müəllifi və Nəcəfin digər böyük ustadlarından istifadə .edərək "ictihad" məqamına çatır

İlahi arif Şeyx Mürtəza Taliqani zamanın böyük övliyalarından hesab olunurdu. O, nafilə və müstəhəb əməllərə çox dəqiq fikir verər və Allah zikrini yaddan çıxarmazdı. Bu böyük alim, adətən təkliyi sevər və başqalarıyla çox da get-gəl etməzdi. Nəcəfdə tədrislə məşğul olan Şeyx Taliqani Həzrət Əlinin (ə) hərəmi, mədrəsə və bə`zi zəruri yerlərdən başqa bir yerə getmirdi. Dərslərində ondan kömək istəyən hər bir tələbəyə öz köməyini əsirgəməz və ibtidadi dərslərdən tutmuş ali səthə qədər bütün səviyyələrdə tədris edərdi. Yazdığı məktubların sonunda vurduğu möhürun üzərinə bu cümlə həkk olunmuşdu: "Allahummə nəcci Murtəza minən-nar" (İlahi, Mürtazanı (cəhənnəm atəşindən nicat ver.)(۱)

Şeyx Mürtəza Taliqanidən nəql olunan hekayə və əhvalatlar avtobioqrafi şərhdən çox onun ruhi mə`nəvi hallarını bəyan edir. Beləliklə, birneçəsini nəql edərək onun həyatı .barəsindəki sözümüzü sona çatdırırıq

**Hidayət nuru**

Ustad Əllamə Məhəmməd Təqi Cə`fəri şeyx Mürtəza Taliqaninin dilindən belə nəql edir: "Mən (Şeyx Taliqani) uzun müddət Taliqanda çobanlıq edirdim. Bir gün yenə qoyunları otararkən Qur`an səsi eşitdim. Bu səs, sanki məni yuxudan ayıltdı. Mən Allahla danışaraq dedim: İlahi, sən öz çağırışını bizim üçün yer üzünə göndərdin. Amma mən ömrümün sonuna qədər sənin bu çağırışına cavab verməməliyəmmi? Həmin vaxt kəndə qayıdıb qoyunları sahiblərinə



---

Əl-icazətul kəbirə", Ayətullah Mər`əşi Nəcəfi, səh. ۲۲۱-۲۲۲" [۱۸] -۱

qaytardım. İşlərimi səhmana salandan sonra təhsil almaq üçün İsfahana yollandım. Beş il İsfahanda təhsil alandan sonra Nəcəfə gedib Axund Xorasaninin dərslərinə qatıldım. Bir müddətdən sonra gördüm ki, bu dərslərdən heç bir fayda ala bilmirəm.(١)

**Mürtəza, Mürtəza...?**

Alim və ariflərin şərhi-halını yazan mühəqqiqlərdən biri belə deyir: Mö`təbər nəqlə görə, böyük arif şeyx Mürtəza Taliqani bir məsələyə görə narahat olub, Nəcəf hövzə tələbələrindən birinə əsəbiləşmişdi. Amma sonradan səhv etdiyini başa düşən Şeyx Taliqani özünü məzəmmət edərək ağlaya-ağlaya deyirdi: "Mürtəza, Mürtəza, it oldun? Mürtəza, Mürtəza, it oldun?

**Axirət səfərinə hazırlıq**

Rəhmətlik həkim Əllamə Cə`fəri buyurur: "Şeyx Mürtəza Taliqaninin yanında "Əsfar" dərsi oxuduğum vaxtlar idi. Məhərrəm ayının başlanmasına hələ iki gün qalmışdı. Yenə dərs almaq üçün onun (Şeyx Taliqaninin) yanına getdim. Şeyx mənə dedi: "Durun gedin. Nə üçün gəlmisiniz?" Mən dərsə görə gəldiyimi ona bildirəndə, dedi: "Ağa dərs qurtardı!"

Öz-özümə fikirləşdim ki, bəlkə Şeyx Məhərrəm ayına görə dərsləri tə`til edib. Ona görə də dedim: Dini-elmi hövzələrdə dərslər tə`til olmayıb. Axı məhərrəm ayının başlanmasına hələ iki gün qalır. Şeyx Mürtəza buyurdu: "Bilirəm. Amma mən müsafirəm, mən müsafirəm! Taliqaninin eşşəyi gedib, palanı qalıb. Ruh gedib, cəsədi qalıb. La ilahə illəllah." Bunu deyəndə gözləri yaşardı.

Mən bu sözlərin onun tezliklə rəhmətə gedəcəyindən xəbər verməsini başa düşdüm. Baxmayaraq ki, onun ruhi-cismi cəhətdən heç bir dərdi



---

١- [١٩] "Tarixe hükəma və ürəfaye mütəəxxir bər Sədrül-mutəəllihin", Mənuçehr Səduqi, səh. ٩٢

yox idi. Şeyx Mürtəza Taliqanidən mənim üçün nəsihətamiz bir söz deməsini xahiş :etdim. O belə dedi: “Afərin, ağa! İndi başa düşdünüz.” Sonra bu şe`ri oxudu

Vaxt varikən belləyib çatdır başa

Qocalıb bükülərkən döyərsən başa

.Yenə də La ilahə illəllah kəlməsini təkrar etdikdə, çöhrəsi daha da nurlandı

Biz iki gün sonra, yə`ni məhərrəm ayının əvvəlində Şeyx Mürtəza Taliqaninin vəfat (etdiyini eşitdik.(۱

**Əlidən (ə) kömək**

Hacı Hadixan Sənəmi Əbhəri belə nəql edirdi: Bir dəfə İraqa ziyarətgahlara getmişdim. Nəcəf-Əşrəfdə olduğum müddətdə hər gün İmam Əlinin (ə) ziyarətinə gedirdim. Bu .müddət ərzində bir nəfər axtarırdım ki, onunla danışıb ürəyimi boşaldım

Bir gün yenə hərəmə gedib, bir xeyli orada əyləşdim. Amma faydası olmadı. Həzrət Əliyə (ə) ərz etdim: Ey Mövlam! Mən sizin qonağınızam. Nəcəfdə olduğum bu neçə gün .ərzində danışmağa bir nəfər tapa bilməmişəm

Hərəmdən çıxıb ixtiyarsız olaraq “Huvəyş” bazarına tərəf yollandım. Oradan Mərhum Seyyid Məhəmməd Kazim Yəzdinin mədrəsəsinə daxil oldum. Mədrəsənin həyətində kiçik bir hücrənin qabağındakı daşın üzərində əyləşdim. Artıq zöhr azanının vaxtı idi. Yuxarı təbəqədəki otaqlardan birindən nurani simalı bir şeyx çıxıb, mədrəsənin damı üstündə azan deməyə başladı. Şeyx qayıdıb hücrəsinə girmək istəyəndə, bir anlıq gözüm onun nurlu çöhrəsinə sataşdı. Azan deməyin tə`sirindən onun yanaqları nur .saçırdı. O hücrəsinə girib qapını örtdü



---

Həmin mənbə, səh. ۹۲-۹۳ [۲۰] -۱

Mən ağlaya-ağlaya ərz elədim: Ey Əmirəl-mö`minin! Neçə gündən sonra bir nəfər tapdım ki, onunla danışım. Amma o da mənə e`tina etmədi. Elə bu vaxt həmin şəxs hücrə qapısını açıb, işarə ilə məni yuxarı çağırdı. Yerimdən qalxıb yuxarı təbəqəyə çıxdım. Hücrəyə daxil olanda hər ikimiz qucaqlaşıb bir müddət beləcə ağladıq. Sonra .sakitcə oturub bir-birimizə tamaşa etdik. Mən sonra şeyxlə sağollaşıb getdim

(Bu fazil şeyx rəhmətlik Şeyx Mürtəza Taliqani idi.(١

**.Bir gecə də qənimətdir**

Arif Taliqani rəhmətə getməmişdən bir gün qabaq mədrəsənin tələbələrini öz hücrəsinə də`vət etmişdi. O, tələbələrlə deyib-gülür və zarafatlaşırdı. Tələbələr hər ".dəfə durub getmək istəyəndə şeyx deyirdi: "Bir gecə də qənimətdir

Mədrəsənin xidmətçisi belə deyirdi: Şeyx rəhmətə getməmişdən qabaqkı gün axşam çağı mənimlə rastlaşanda dedi: "Səhər sübh namazına durub dəstəmaz alanda mənim rəhmətə getdiyimi eşidəcəksən." Mən onun dediklərini başa düşməyib, zarafat kimi .qə`bul etdim

Sübh azanında Şeyx mədrəsənin damına çıxıb azan dedi. Sonra qayıdıb öz hücrəsinə girdi. Şeyx həmişəki adəti üzrə hər gün sübh namazından sonra mədrəsənin həyətində gəzişərdi. Amma həmin gün onun hücrəsindən çıxmadığını görəndə, hamı narahat oldu. O, hücrəsində üzü qibləyə uzanıb canını Allaha tapşırmışdı. Tələbələr qışqırdılar: Şeyx Mürtəza öldü! Elə bu vaxt dəstəmaz alan mədrəsə xidmətçisi Şeyxin (dünən dediklərinin zarafat deyil, həqiqət olduğunu başa düşdü.(٢

İlahi arif şeyx Mürtəza Taliqani ١٩۴٢-ci il məhərrəm ayında vəfat edir və Həzrət Əlinin .(ə) hərəminin həyətində dəfn olunur



---

Məad şenasi", Əllamə Tehrani, ١-ci cild, səh. ١٠٨-١٠٩" [٢١]-١

Tarixe hükəma və ürəfaye mütəəxxir bər Sədrül-mutəəllihin", səh. ٩٣. "Məad" [٢٢]-٢ şenasi", c. ١, səh. ١٠٩-١١٠

## İKİNCİ FƏSİL: Kamil arif Əllamə Qazi

### İşarə

Həyatı

Ayətullah Behcətin mə`nəvi-əxlaqi şəxsiyyətinin formalaşmasında Əllamə Qazinin çox böyük rolu və tə`siri olmuşdur. Ustadın tələbəsinə etdiyi bu qəribə tə`sir mə`rifət əhlinə xasdır. Şiə aləminin fəxri, ibrətamiz həyat tərzi və Behcətin ustadı olan Ustad .Qazinin şərhi-halını burada qeyd etməyi özümüzə borc bildik

Əllamə Seyyid Mirzə Əli Qazi ۱۸۶۴-cü il zilhəccə ayının ۱۳-ü Təbriz şəhərində elm və mə`rifət nuru ilə dolu bir ailədə dünyaya göz açdı. O, Mirzə Rəhim Təbatəbai ibn Mirzə Əhmədin oğlu, Mirzə Hüseynin oğludur(۱) ki, soy kökü həzrət Əliyə (ə) çatırdı.(۲) Atası Mirzə Hüseyn Qazi elm və mə`rifət əhli idi. Mirzə Şirazinin tələbəsi olmuş Mirzə Hüseyn Qazi "həmd və ən`am" surələrinə təfsir yazmışdır. Təbrizə gedərkən mərhum Mirzə Şirazi onunla sağollaşıb dedi: "İndiki gedirsən, heç olmasa gün ərzində özünə bir saat vaxt ayır." Bir müddətdən sonra Mirzə Şirazi başqalarından onun haqqında soruşanda dedilər: "Hacı, sənin dediyin o bir saat iyirmi dörd saata çatıb. Mirzə Hüseyni .həmişə "müraqibə" halındadır. O, ۱۸۹۳-cü il fani dünya ilə vidalaşmışdır

Əllamə Qazi elm və maarifi atasının və digər böyük ustadların yanında öyrənmişdir. Bu ustadlar sırasında Mirzə Musa Təbrizi (Haşiyətul-vəsail kitabının müəllifi) və Seyyid Məhəmməd Əli Qaraçədağinin ("Haşiyeyi şərhe lüm`ə" kitabının müəllifi) adını qeyd .etmək olar

Əllamə Qazi ۱۸۹۲-ci ildə Nəcəf-Əşrəfə yollanır. Orada Molla Məhəmməd Şərəbyani, Şeyx Məhəmməd Həsən Mamaqani, Şeyx



---

۱- [۲۳] "Nüqəbaül-bəşər", Ağa Bozorg Tehrani, ۴-cü cild.

۲- [۲۴] "Mehri taban", Seyyid Məhəmməd Hüseyn Hüseyni Tehrani, səh. ۳۴-۳۵

Əşşəriyeyi İsfahani, Şeyx Məhəmməd Kazim Xorasani və Mirzə Hüseyn kimi fazil alimlərdən dərs alır.(1)

Maarif və Allaha doğru gedən yolda Axund Molla Hüseynqulu Həmədaninin şagirdi seyyid Əhməd Kərbəlayinin dərslərindən bəhrələnmiş və özü də bu yolda bir çoxlarını sirab etmişdir.

Onun əsərlərindən "Təfsiri-Qur`an" kitabını qeyd etmək olar. Bu kitabda Qur`anın əvvəlindən "Ən`am" surəsinin ۹۲-ci ayəsinə qədər təfsir etmişdir.(2) Onun digər əsərlərindən biri də iyirmi bir yaşında Şeyx Müfidin "İrşad" kitabına yazdığı düzəlişdir.(3)

Onun həyatının parlaq nümunələrindən maddiyyatdan uzaq və tövhidə çatmış tələbələr yetişdirməsini misal çəkmək olar. Belə imanlı tələbələr tərbiyə etmək çox az adama qismət olur. Ötən yarım əsrdə İraq və İranın mühüm məntəqələri şiə aləminin fəxri–Əllamə Qazinin yetişdirdiyi tələbələrin mə`nəvi hakimiyyəti altında idi. Misal olaraq Əllamə Təbatəbai və kamil arif Ayətullah Behcətin Qum elmi hövzəsindəki yüksək tə`sirini qeyd etmək olar. Tehranda Ayətullah Şeyx Məhəmməd Təqi Amuli və son zamanlar Ayətullah Şeyx Abbas Hatif Quçani, fars vilayətində Ayətullah Dəstğeyb və Ayətullah Nəcabət Şirazi, Azərbaycanda (İran) Ayətullah Şeyx Əli Əkbər Mərəndi, Təbrizdə Ayətullah Məhəmməd Həsən İlahi Təbatəbai, İraq və Məşhəddə də bu ilahi alimin mə`nəvi-əxlaqi dəsrlərindən bəhrələnmiş bir çox şagirdlərini misal çəkmək olar. Hal-hazırda onun əxlaqi yolunun davamçıları kamal aşiqlərini Əhli-beyt və Qur`an maarifinin zülal çeşməsindən sirab edərək, Allaha doğru gedən yola hidayət edirlər.

Ustad Qazinin tərbiyəvi göstərişləri barədə Ayətullah Hüseyni Tehrani belə deyir:



---

۱- [۲۵] "Nüqəbaül-bəşər", Ağa Bozorg Tehrani, ۴-cü cild, səh. ۱۵۴۵-۱۵۶۶

۲- [۲۶] Həmin.

۳- [۲۷] "Mehri taban", Seyyid Məhəmməd Hüseyn Hüseyni Tehrani, səh. ۳۴

Qazi şagirdlərindən hər birinə onların iste`dadlarına uyğun, şər`i əməllərin batini ədəb-ərkanına riayət etməklə qanunlar çərçivəsində xüsusi-əxlaqi tapşırıqlar verirdi. Bununla onların qəlblərini qeyb aləmindən gələn ilhamları qəbul etməyə hazır edirdi. Onun “Səhlə” və “Kufə” məscidlərində kiçik bir hücrəsi (otaq) var idi. Bə`zən gecələr bu hücrələrdən birində sübhə qədər ibadətlə məşğul olar və bunu öz şagirdlərinə də .tövsiyyə edərdi

Son dövrümüzün nadir incilərindən olan Ustad Qazi ١٩٣٥-ci il rəbiül-əvvəl ayında əbədi dünyaya qovuşdu. O öz hicrəti ilə mə`nəviyat oduyla yanan ürəklərdə matəm (qurdu.(١)

#### Qazinin elmi–tərbiyəvi metodu

Rəhmətlik Qazi dövrünün adlı-sanlı müctəhidlərindən olmasına baxmayaraq, öz evində tədris etməyi daha üstün tutardı. O fiqh bölməsindən dərs deyər və camaat namazını da tələbələri ilə öz evində qılardı. Ustad Qazi namazı çox yavaş qıldığı üçün, onun namazları həmişə uzun çəkərdi. Günəş qürub edən kimi “şam” namazını qılar və .sonra isə namazın tə`qibatını oxumağa başlayardı

Mübarək ramazan ayında tələbələr onun camaat namazından feyz almaq üçün Qazinin mənzilinə gedərdilər. Bə`zi tələbələr günəş batan vaxtı göyün üzündəki qızartı tam itməmiş namaz qılmadıqları üçün, Qazidən bir az da səbir etməsini xahiş edəndə, .o da gözləyərdi. Rəhmətlik Qazi günəş tam batan kimi iftar edərdi

Ramazan ayının yalnız birinci və ikinci ongünlüyündə gecələr tə`lim və tədris edərdi. Amma ramazanın sonuncu ongünlüyündə dərsləri tə`til edər və ayın sonuna qədər heç kim Ağa Qazini görməzdi. Bu müddət ərzində tələbələr onu görmək üçün Kufə və Səhlə məscidlərinə və Kərbəlaya



---

Nüqəbaül-bəşər”, Ağa Bozorg Tehrani”, ٤-cü cild, səh. ١٥۶۶“ [٢٨] -١

gedər, amma ondan xəbər tuta bilməzdilər. Bu onun ömrünün sonuna qədər icra .etdiyi proqramlardan biri idi

Rəhmətlik Qazi ərəb dilini çox gözəl bilirdi. Onun öz dediyinə görə qırx min ərəb sözünü hifz etmişdi. Ərəbcə şe`r oxuyanda, hətta ərəblər belə onun qeyri-ərəb (İranlı) .olduğunu ayırd edə bilməzdilər

Bir gün Şeyx Abdullah Mamaqani sözarası Qaziyə deyir: Mən ərəb dili və ədəbiyyatını kamil bildiyim üçün əgər bir şəxs ərəb dilində şe`r desə, onun ərəb və ya qeyri-ərəb olduğunu dərhal deyə bilərəm. Hətta əgər o şe`r gözəl fəsahət və bəlağətlə deyilmiş .olsa da

Qazi ərəb şairlərin birindən bir qəsidə oxumağa başlayır. Qəsidənin ortalarında barəsində qabaqcadan fikirləşmədiyi şe`rlərindən bir neçəsini də əlavə edir. Sonra Şeyx Mamaqaniyə buyurur: "Bunlardan hansını qeyri-ərəb yazmışdır." Şeyx ayırd edə .bilmir

Ayətullah Qazi Qur`anı təfsir və mə`na etməkdə çox yüksək iste`dada malik idi. Rəhmətlik Əllamə Təbatəbai buyurmuşdur: "Qur`anda ayəni ayə ilə təfsir etmək metodunu Qazi bizə öyrətmişdir. Biz onun kəşf etdiyi bu yolun davamçılarıyıq. Həmçinin "Fiqhul-hədis" deyilən on dörd mə`sumdan nəql olunmuş hədislərin ".mə`nasını dərk etmək metodunu da ondan öyrənmişdik

Rəhmətlik Qazi nəfsin və əxlaqın paklaşdırılmasında, ilahi maarif sahəsində, seyri-süluk məqamında qeybi mükaşifələr və eyni müşahidələr xüsusunda əsrinin yeganəsi olmuşdur. İlahi sirlərlə dolub-daşan və əzəmətli bir dağa bənzəyən Qazi tələbələrinin mə`nəvi-əxlaqi tərbiyəsinə xüsusi diqqət yetirərdi. Gündüzlər tələbələri üçün öz evində xüsusi məclis təşkil edər və onları moizə və nəsihət etməyə çalışardı. Onun verdiyi tərbiyəvi dərslər nəticəsində böyük şəxsiyyətlərin bir çoxu haqq yolunda (addımlayaraq yüksək kamal və məqam sahibi olmuşlar.(١



---

Mehri taban", Hüseyni Tehrani" [۲۹] -۱

**Müvəhhidlər ağası**

Əxlaq ustadlarından biri nəql edirdi ki, Əllamə Təbatəbai deyirdi: “Rəhmətlik Qazi Allah təqdirinə razı və tövhiddə qərq olmuş bir şəxs idi. O, otuz altı nəfərlik bir ailəyə başçılıq etməsinə baxmayaraq, özünü elə göstərirdi ki, sanki heç qəm-qüssəsi yoxdur. Bə`zən, Qazinin mənzilinə gedəndə onun ucadan güldüyünü görərdik. Biz onun bu hərəkətindən problemlərinin daha da çoxaldığını başa düşərdik. Çünki o nə qədər .çətinlikdə olsa, bir o qədər də şad olurdu

**Seyyid Əhməd Kərbəlayinin göz yaşları**

:Şeyx Məhəmməd Hüseyni Xorasani Seyyid Əli Qazidən belə nəql edir

Bir dəfə gecəni oyaq qalmaq üçün “Səhlə” məscidinə getmişdim. Gecə yarısı bir nəfər“ məscidə daxil olub, İbrahim məqamı deyilən yerdə ibadətlə məşğul olmağa başladı. Sübh namazını qılandan sonra səcdəyə gedərək, gün çıxana qədər başını səcdədən .qaldırmadı. O, səcdədə yanıqlı-yanıqlı ağlayıb, Allah-təala ilə münacat edirdi

Mənə çox maraqlı idi ki, bu şəxsin kim olduğunu bilim. Yaxınlaşanda, onun Seyyid Əhməd Kərbəlayi olduğunu gördüm; o qədər göz yaşı axıtmışdı ki, səcdəyə getdiyi yer palçıq olmuşdu. Səhər açılan kimi qalxıb hücrəsinə getdi. Amma Seyyid Əhməd (Kərbəlayi dərs deyərkən onun gülüş səsi hətta məsciddən çölə də yayılırdı.”(١

**Zahidlik nümunəsi**

Ustad Qazi şagirdlərindən hər birinə iste`dadına uyğun, əhkami əməllərin batini ədəb-ərkanına riayət etməklə şər`i qanunlar çərçivəsində xüsusi əxlaqi tapşırıqlar verərdi. Bununla da onların qəlblərini qeyb



---

Tarixe hükəma və ürəfaye mütəəxxir bər Sədrül-mütəəllihin”, Mənuçehr“ [۳۰] -۱ Səduqi, səh. ۱۳۵

aləmindən gələn ilhamları qəbul etməyə hazırlayırdı. Şagirdlərinə tapşırmışdı ki, namaz qıldığınız, Qur`an oxuduğunuz və zikr etdiyiniz vaxt, gözəl sima və ya qeyb aləminə aid olan bə`zi şeylər müşahidə etsəniz, onlara diqqət etmədən öz ibadətinizlə məşğul olun!

Rəhmətlik Qazi əməl baxımından canlı nümunə idi. Nəcəf camaatı, xüsusilə də elm əhli ondan qəribə əhvalatlar nəql edirlər. Böyük bir ailə ilə ağır maddi durumda yaşamasına baxmayaraq təvəkkül, təslim və tövhid məqamına elə qərq olmuşdu ki, bu çətinliklər onu az da olsun haqq yolundan ayıra bilmirdi. Nəcəf müctəhidlərindən biri deyir: "Bir gün meyvə-tərəvəz dükanına getmişdim. Qazi də dükanda idi. O, əyilib kahı götürürdü. Amma başqalarının tam əksinə olaraq yarpaqları cod və solmuş kahıları seçirdi. Qazi yığdığı kahıları tərəzidə çəkmək üçün dükançıya verdi. Sonra bu kahıları əbasının altına tutub evə yollandı. O vaxtlar mən cavan bir tələbə, Qazi isə yaşlı qoca idi. Onun dalınca gedib dedim: Ustad, mənim sizə bir sualım var. Niyə siz hamının etdiyi işin tam əksinə olaraq xarab və solmuş kahıları aldınız? Dedi: "Ey cavan! Bu satıcı çox kasıb adamdır. Mən bə`zi vaxtlar ona kömək edirəm. Amma iki səbəbə görə istəmirəm ona etdiyim bu kömək əvəzsiz olsun. Birincisi budur ki, onun izzət və şərəfinin aradan getməsini istəmirəm. İkincisi isə, Allah eləməmiş, zəhmətsiz qazanca adət edib öz alış-veriş işini boş tutmasın. Bizim üçün təzə kahı ilə solmuş kahının heç bir fərqi yoxdur. Mən bilirəm ki, bunları alan olmayacaq və satıcı günorta vaxtı dükanı bağlayanda bunları çölə tökəcək. Onun zərər çəkməməsi üçün mən onları aldım.(۱)"

## Əllamə Qazinin xüsusi məclisləri

Şeyx Məhəmməd Hüseyn Xorasani öz ustadı Əllamə Qazi haqqında belə deyir: "Ustad Qazi adətən gecələr əxlaq məclisi qurar və çıraq yandırmazdı. Nəcəf alimlərindən "batin əhli" olan bə`ziləri də məclislərində iştirak



---

۱- [۳۱] "Mehri taban", Ayətullah Hüseyni Tehrani, səh. ۳۰-۳۲

edərdilər. Adətən, əxlaqı necə islah etmək, mə`rifət və həmçinin irfan haqqında da söhbət edərdi. Amma əksər vaxtlarda insanın zati mə`rifəti və özünütanıma bəhslərindən söz açar və məclisə qəribə bir şəxs daxil olsaydı, dərhal sözünü dəyişib İmam Hüseynin (ə) ziyarətindən bəhs edərdi. Onun dediyinə görə insanların iste`dadları müxtəlifdir. Hər sözü hər adama demək düz deyil.(١)

#### Əllamə Qazinin Ayətullah Xoyi Həzrətlərinə əməli tapşırığı

Nəcəfdə dini təhsillə məşğul olduğum illərdə müstəhəb əməllərə, həmçinin, vird və" zikrlərə çox fikir verirdim. Hərdən Seyyid Əli Qazinin mə`nəvi feyzlə zəngin olan məclislərində iştirak edir və o böyük şəxsiyyətin qüdsi nəfəsindən bəhrələnirdim. Bir gün ona dedim: "Mümkünsə, mənə də bir şey öyrədin, əməli bir tapşırıq verin. Qazi mənə əməli bir tapşırıq verib dedi: "Qırx gün bu tapşırığa əməl edərsən." Mən Qazinin verdiyi tapşırığa qırx gün əməl etdim. Qırxıncı gün mükaşifə halında gələcəkdə mənim üçün nə baş verəcəyini gördüm. Özümü, evdə minbərdə tədris etdiyimi və camaatın dəstə-dəstə mənim yanıma gəldiyini müşahidə etdim. Bütün bunlar sanki bir lent yazısı kimi gözümün önündən ötüb keçirdi. Birdən, Əli (ə)-ın hərəminin minbərindən "İnna lillah və inna iləyhi raciun" nidası səsləndi. Ey camaat! Ayətullah Xoyi vəfat etdi. Bu səsi eşidəndən sonra mükaşifə halından ayrıldım.(٢)

#### Gecə namazı haqqında tövsiyə

Əllamə Təbatəbai buyururdu ki, təhsil üçün Nəcəf-Əşrəfə getmişdim. Qohumluq əlaqəmiz olduğuna görə bə`zi vaxtlar rəhmətlik Qazinin hüzuruna gedərdim. Bir gün mədrəsənin darvazası önündə dayanmışdım. Qazi



---

١- [٣٢] "Tarixe hükəma və ürəfa", Mənuçehr Səduqi, səh. ١۴١

٢- [٣٣] "Mərdane elm dər meydane əməl", Seyyid Ne`mətullah Hüseyni, ٥-ci cild, səh. ٣٨۶-٣٨٧

oradan keçib gedərkən məni görüb yaxınlaşdı və əlini çiynimə qoyub dedi: “Övladım, əgər bu dünyanı istəyirsən, gecə namazı qıl və əgər axirəti istəyirsən, yenə də gecə ”.namazı qıl

Onun bu sözü mənə çox böyük tə`sir etdi. Mən İrana qayıtmazdan əvvəlki beş il ərzində gecə-gündüz Qazinin qiymətli göstərişlərindən bəhrələnirdim. İrana qayıdandan sonra da vəfatına qədər onunla əlaqə saxlayırdım. O, məktublaşma yolu ilə mənə xüsusi tapşırıqlar verirdi. Bizim aramızda ustad-şagird əlaqəsi var idi. “Biz ələ (gətirdiyimiz bütün nailiyyətlərə görə Ustad Qaziyə borcluyuq.(١

## Namazı ilk vaxtda qılmağın tə`siri

Rəhmətlik Əllamə və Behcət Ayətullah Qazidən nəql edirlər ki, buyurarmış: “Əgər bir şəxs vacib namazlarını həmişə ilk vaxtında qılsa və ali məqamlara çatmasa, məni (lə`nətləsin və gəlib üzümə tüpürsün.”(٢

## İbrət dərsi

Böyük ustadlardan biri xatirə dəftərində rəhmətlik Qazinin barəsində belə bir əhvalatı :qeyd etmişdir

Qazinin çox kasıb və pulsuz günlərindən biri idi. Bir nəfərin də ona borcu var idi. Qazi,“ dava gücünə də olsa gedib həmin şəxsdən pulunu almaq qərarına gəlir. Elə bu fikirlə mənzilindən çıxanda yolda iki nəfərin bir-biri ilə dalaşdığını görür. Onlardan biri digərinə belə deyirdi: Dava etmək lazım deyil. Onsuz da mən sənin pulunu .qaytaracağam

.O, bu səhnəni görəndə öz işi yadına düşür və geri qayıdır



---

Mehri taban”, Ayətullah Hüseyni Tehrani, səh. ٢٥-٢٦“ [٣۴] -١

Dər məhzəre büzürqan”, Qərəviyan, səh. ٩٩, Ayətullah Misbah Yəzdinin“ [٣٥] -٢ .dediklərinə əsasən

Qazinin öz dediyinə görə həmin vaxtdan sonra maddi durumu yaxşılaşır və ".gözləmədiyi bir yerdən əlinə pul gəlir

**Məhbubla müzakirə**

:Mö`təbər şəxslərdən biri nəql edirdi ki, ustadlardan biri belə deyirmiş

Rəhmətlik Qazi ömrünün son günlərini Məşhəddə ailəsinin yanında qalırdı və ağır" xəstə olduğundan evdən çölə çıxa bilmirdi. Bu vaxtlarda Əllamə Təbatəbai ara-sıra ona baş çəkməyə gedər və Qazi üçün bir kitab١ oxuyardı. Bə`zən onların bu görüşü çox uzun çəkərdi. Bir dəfə rəhmətlik Qazinin xanımı Əllamə Təbatəbaiyə deyir: "Mümkünsə bizə tez-tez gəlin və Qazinin yanında çox qalın. Çünki siz burada olanda, ".sanki onun ağrıları sakitləşir və özünü daha gümrah hiss edir

Bəli, insan Allahla ünsiyyət yaradıb "qürb" əhli olduğu zaman, istər-istəməz, qəlbində .ilahi şövq artır, dərdi-qəmi və hətta ağır xəstəliklərin belə ağrısını unudur

**Seyyid Qazinin kəramətləri**

Nəcəf dostlarımdan Nəcəf elmi hövzəsinin tanınmış ustadlarından birinin dilindən nəql :edirlər ki, deyirdi

Mən ariflər ustadı Mirzə Əli Qazi Təbatəbai, onun dilindən nəql edilən mətləblər və onun haqqında tez-tez qulağıma çatan qəribə əhvalatlar barəsində şəkdə idim. Öz-özümə həmişə deyirdim görən bütün bu danışılanlar doğrudur, yoxsa yalan? Deyilənə görə tərbiyə etdiyi şagirdləri, belə hal sahibi olurlar, elə kamala çatırlar–düzdür, yoxsa təxəyyül? Uzun müddət bu fikirlər zehnimdə dolaşırdı və tərəddüddən yaxa qurtara bilmirdim. Kimsənin mənim bu fikrimdən xəbəri yox idi. Bir gün ibadət və Kufə məscidinin ziyarət buyuruqlarını yerinə yetirmək üçün həmin məscidə yollandım. (Əvvəldə qeyd

etdiyimiz kimi, rəhmətlik Qazi Kufə məscidində çox olurdu. İbadət üçün orada xüsusi hücrəsi də var idi. Kufə və Səhlə məscidlərinə çox rəğbət göstərir və əksər gecələri (.sübhə qədər həmin yerlərdə ibadət edirdi

Məscidin həyətində dolaşarkən Qazi ilə rastlaşdım. Salamlaşıb bir-birimizlə hal-əhval tutduq və söhbət edə-edə gəlib məscidin arxa hissəsinə çatdıq. Məscidin arxa hissəsi çöllü-biyabana tərəf yaxın olduğundan, get-gəl də az olurdu. Məscidin hündür divarının dibində qiblə tərəfə doğru hər ikimiz yerə oturduq ki, bir az dincəlib yenidən məscidə gedək. Aramızda söhbət qızışdı. Rəhmətlik Qazi ilahi ayələrin sirlərindən mənə hikmətli mə`nalar deyirdi. Tövhidin əzəmətli və cəlallı məqamından, bu yola qədəm qoymaqdan, bu yolun insan yaradılışının yeganə hədəfi olmasından maraqlı .söhbət edir, dediklərinə tutarlı dəlillər gətirirdi

Mən yenə də tərəddüd içində fikirləşirdim ki, mən nə bilim bu deyilənlər doğrudur, ya yox? Deyilənlərə şübhə edirəm. Ola bilər doğru olsun, amma mənim xəbərim olmasın. Əgər ömrüm bu minvalla keçsə, vay mənim halıma, əgər deyilənlər doğru olsa və bizə bir şey çatmasa, vay halıma! Başqa bir tərəfdən, eşitdiklərimin nə dərəcədə doğru olduğunu bilmədiyim üçün şəkdə qalmışdım. Bilmirdim dalınca gedim, yoxsa .getməyim

Bu fikirdə idim ki, qarşıdakı təpənin deşiyindən böyük bir ilan çıxıb divarın paralel istiqamətində bizə doğru sürünməyə başladı. (Bu yerdə çoxlu ilan olur və əksər hallarda camaat onları görürdü. Amma indiyə qədər kimsəni çaldığını eşitməmişdik.) İlan bizim qarşımıza çatanda məni ixtiyarsız vahimə götürdü. Rəhmətlik Qazi ilana işarə edib dedi: “Mot biiznillah! Allahın izni ilə öl! Həmin dəqiqə ilan yerində quruyub .qaldı

Qazi heç nə olmayıbmış kimi söhbətini davam etdirməyə başladı. Bir az da söhbət edəndən sonra qalxıb məscidə getdik. Qazi məscidin ortasında iki rəkət namaz qılandan sonra öz hücrəsinə getdi. Mən də məscidin bir-iki ziyarət əməllərini yerinə yetirəndən sonra Nəcəfə qayıtmaq qərarına gəldim. Ziyarət etdiyim an birdən yadıma düşdü ki, bayaq məscidin arxasında baş verən

əhvalat, Qazinin gördüyü o iş həqiqət idi, yoxsa gözbağlayıcılıq? Dedim, bəlkə kişi məni sehirləyib və mənə elə görsənib? Bu fikirlər məni əldən saldı, daha necə ziyarət oxuduğumu bilmədim. Dedim, yaxşısı budur gedim görüm ilan həqiqətən ölüb, yoxsa dirilib qaçıb? Ziyarəti başa çatdırıb tələsik çölə çıxdım. Bayaqkı oturduğumuz yerə gedib gördüm ki, ilan quru ağac kimi yerə sərilib. Ayağımla tərpətdim, gördüm hərəkətsizdir. Ağlım başımdan çıxdı. Məscidə qayıtdım ki, bir-iki rəkət də namaz qılıb Nəcəfə dönüm. Amma bacarmadım və fikir-xəyal məni götürdü ki, əgər bu işlər ?haqdırsa, bəs bizim niyə xəbərimiz yoxdur

Rəhmətlik Qazi öz hücrəsində ibadətlə məşğul idi. O, öz hücrəsindən çıxanda, mən də məsciddən çölə çıxdım. Məscidin həyətində yenə də onunla rastlaşanda, gülümsünüb :mənə dedi

!?Ay canım, imtahan da etdin, daha nə istəyirsən

**!Vadiyüs–səlamdan anladım**

Mirzə Əli Qazinin əksər şagirdləri nəql edirlər ki, Qazi Nəcəfin vadiyüs-səlam qəbiristanlığına ziyarət üçün çox gedərdi. Ziyarəti üç-dörd saata qədər çəkərdi. Hərdən şagirdləri də onunla gedirdilər və Qazi bir kənarda səssiz-səmirsiz sükut içində əyləşərdi. Bu haldan şagirdlərin çoxusu yorular və geri qayıdardılar. İşin nə yerdə olduğunu bilməyən şagirdlər Qazinin bu əhvalatına e`tiraz edib öz qəlblərində ?deyərdilər: Axı, ustad üç-dörd saat vaxtı niyə burada oturur? Görən yorulmur

Tehranda olduqca təqvalı, alicənab bir alim var idi. Həqiqətdə düzünü demək istəsək, bu şəxs olduqca yaxşı adam idi. Bu şəxs Qazinin birinci silsilə irfan və əxlaq yönlü şagirdlərindən olan Məhəmməd Təqi Amuli idi. Məhəmməd Təqi Amuli belə nəql edirdi: “Mən həmişə görürdüm ki, Qazi gedib ۲-۳ saat Vadiyüs-səlamda oturur. Öz-özümə dedim: İnsan qəbristanlığa gəldi, gərək ziyarət edib tez də getsin. Bir fatihə oxuyub ölülərin ruhuna tapşırsa, bəsdir, daha bu

...qədər burada oturub vaxt öldürmək nəyə lazımdır, görüləsi o qədər vacib iş var ki

Bu narazılıq həmişə mənim qəlbimdə dururdu, amma heç kəsə, – hətta ən səmimi bildiyim dostlarıma belə bu barədə bir söz deməmişdim. Günlər ötdü, illər sovuşdu, mən bu minvalla hər gün ustadın xidmətinə gedir, onun elm və mə`rifət dəryasından incilər toplayırdım. İş elə gətirdi ki, Nəcəf-Əşrəfdən İrana qayıtmaq fikrinə düşdüm. Amma bu səfərin nə dərəcədə məsləhətə uyğun olduğunu bilmirdim və tərəddüddə qalmışdım. Bu niyyətimi heç kəs bilmirdi. Bir axşam yatağıma uzanmışdım. Otaqda yataq taxtının ayaq tərəfində taxçanın üstünə elmi və dini kitablar yığmışdım. Yatan zaman təbii olaraq ayaqlarım kitablara tərəf uzanmış olurdu. Öz-özümə dedim: Görən, qalxıb yatağımın səmtini dəyişim, yoxsa lazım deyil, belə qalsın? Çünki kitablar tam mənim ayaqlarımın müqabilində idi. Fikirləşdim ki, bununla kitablara hörmətsizlik olmaz. Bunu deyib yatdım. Səhər tezdən ustadım Qazinin yanına gedib, salaməleykdən sonra dedi: “Sənin İrana qayıtmağın məsləhət deyil. Kitablara tərəf də ”.ayağı uzatmaq elmə, kitaba ehtiramsızlıq sayılır

Bu sözləri eşidəndə, diksinib özümü itirdim. Dodağım əsə-əsə dedim: Ustad, siz bunu :haradan bilirsiniz? Dedi

”.Vadiyüs-səlamdan“

Qazi bu son cümləsi ilə uzun müddət Məhəmməd Təqi Amulinin qəlbində ustadının (vadiyüs-səlamda oturması ilə əlaqədar dolaşan şübhələrə son qoydu.(١

**.Qarnının fikri səni götürməsin**

Höccətü-lislam Seyyid Mehdi Qazi Təbatəbai, rəhmətlik Seyyid Əli Qazi Təbatəbainin oğlu idi. Qazinin oğlu Seyyid Mehdi “Cəfr” elmində kamil bir ustad olmasıyla yanaşı, .“süls və nəsx” xətlərini də çox gözəl məharətlə yazırdı



---

Əllamə Hüseyn Hüseyni Tehrani, “Məad şenasi”, c. ٢, səh. ٢٩١ [٣٧] -١

Zahidlər kimi ömür sürən Seyyid Mehdi ömrünün sonuna qədər subay yaşamışdır. O, :mənə belə nəql edirdi

Nəcəf-Əşrəfdə hövzə təhsili aldığım vaxtlar “Cəfr” elmini də çox böyük sə`ylə“ öyrənməyə çalışırdım. Rəhmətlik atam həmişə mənə nəsihət edib deyərdi: “Sən bu elmləri (cəfr) öyrənməklə bir şey əldə edə bilməyəcəksən.” Ömrünün son günlərini yaşadığım bir vaxtda atamın dediklərinin həqiqət olduğu mənim üçün isbat oldu. .İnsana bu elmlərdən qaranlıq və zülmətdən başqa bir şey nəsib olmur

Atam Seyyid Əli Qazi böyük bir ailə başçısı idi və Allah yolunun həqiqi yolçusu olduğundan dünya gəlirlərinə əhəmiyyət verməzdi. Buna görə də biz çox kasıb yaşayır və hətta gündəlik ehtiyaclarımızı ödəməyə belə çətinlik çəkirdik. Bizim gündəlik nahar yeməyimiz kiçik çörək tikələri və ayran olurdu. Bir gün anam mənə dedi: Get atanın hücrəsinə, ondan bir az pul al. Heç olmasa, bu gün bir yaxşı yemək yeyək. Ayran-çörək .yeməkdən bədənimizdə güc qalmayıb

Rəhmətlik atam siqaret çox çəkərdi. Siqaret külünü hücrəsinin arxa tərəfindəki kiçik otağa tökərdi. Hücrəyə daxil olub salam verəndə, nə üçün gəldiyimi dərhal başa düşüb :dedi: “Seyyid Mehdi! Bu otaqdakı zibilləri (külü) təmizləmək lazımdır.” Dedim

Ayaq üstə durmağa belə halım yoxdur, o ki, qaldı bu ağır işi görəm. Buyurdu: “Bu kisənin qıraqlarını ki, tuta bilərsən.” Sonra xakəndazı götürüb zibilləri kisəyə tökməyə başladı. Xakəndazdakı zibilin içindən bir qızıl əşrəfi tapıb dedi: “Bu bir əşrəfi!” Yenə də xakəndazı zibillə doldurub kisəyə tökdü. Hər dəfə bir qızıl əşrəfi mənə verib dedi: “Bu üç əşrəfini götür get! Bundan sonra daha bu qədər qarnınızın fikrini çəkməyin. Allah (ruzi yetirəndir.”(١



---

Dər məhzəre lahutiha”, Məhəmmədəli Mücahidi, səh. ۴۲۵-۴۲۶“ [۳۸] -۱

## ÜÇÜNCÜ FƏSİL: Ayətullah Behcət hidayətçi kimi

### Seyri–süluka də`vət

Ayətullah Behcət Nəcəf-Əşrəfdə olduğu vaxtlar Ayətullah Xoyinin dərslərində iştirak edərdi. Bir gün onun dərsində deyilən mətləblə razılaşmayıb məsələyə öz iradını bildirir. Dərs bitdikdən sonra Ayətullah Xoyi söhbət əsnasında Behcətə deyir: “Tutduğun irad çox mühümdür. Kim bunu sənə deyib? Bu sözlər sənin öz fikrindir, yoxsa başqasının?” Behcət söhbəti başqa səmtə yönəldib deyir: “Yaxşı olar ki, siz də Qazinin yanına gedib, onunla əlaqə saxlayasınız.” Həmin söhbətdən sonra Ayətullah Xoyi bu barədə çoxlu götür-qoy edir. Həvayi-nəfs ona Qazinin yanına getmə deyir. Buna baxmayaraq o öz nəfsinə qələbə çalaraq Qazinin yanına gedir. Ondan xüsusi .tapşırıqlar alan Xoyi uzun müddət onlara əməl edir

Ramazan ayında hər axşam min dəfə “Qədr” surəsini oxumaq Qazinin Xoyiyə verdiyi xüsusi tapşırıqlardan biri idi. Bir dəfə yenə “Qədr” surəsini oxuduğu vaxt gələcəkdə onun üçün nə baş verəcəyini müşahidə edir. Mərcəiyyət məqamından tutmuş ölənə qədər bütün olacaqlar gözü önündən ötüb keçir. Amma sonralar onun həyatında baş verən dəyişikliklərə görə Qazinin verdiyi xüsusi tapşırıqlara əməl edə bilmir və onunla .olan əlaqəsi kəsilir

Ayətullah Xoyi rəhmətlik Qazinin yanına getməzdən əvvəl onun seyri-sülukdakı metodunu bəyənmir və hətta bu fikrini də ona söyləyir. Əllamə Qazi cavabında ona deyir: “Sən də gələcəksən!” Doğrudan da bir müddətdən sonra Xoyi Əllamə Qazinin .yanına gedib ondan xüsusi tapşırıqlar alır

İlahi insanlar "seyri-süluk" məqamına çatmaq üçün həmişə dünyəvi və nəfsani ləzzətlərdən pəhriz edir və ancaq zəruri ehtiyaclarını tə`min etməklə kifayətlənirlər. Bu xüsusi pərhiz və ehtiyatlar nəticəsində adi insan Allah tərəfindən seçilmiş xass bəndəyə çevrilir. Bəli, bu sə`y və təlaş nəticəsində onların bəsirət (mələkut) gözləri .açılır

Ayətullah Behcət heç vaxt yazdığı "Tozihul məsail"i çap etdirmək istəmirdi. Hər dəfə onunla bu haqda söhbət edəndə belə cavab verərdi: "Başqaları da bu işin öhdəsindən gələ bilərlər." Böyük müctəhidlərin vəfatından sonra, ictimaiyyət və yaranan mə`nəvi ehtiyac və islam alimlərinin ardıcıl tə`kidlərinə əsasən, Behcət adının qeyd edilməməsi şərtilə "Tozihil-məsail" risaləsinin çap edilməsinə icazə verdi. Nəhayət, onun risaləsi çap olur, amma adsız və altıncı çapdan sonra kitabın üzərində "Əl-əbd Məhəmməd Təqi Behcət" yazılır. Bu ilahi nurun tərənnümüdür ki, Allah övliyalarının əhvalatlarında .bu cür özünü göstərir

Onun (Behcət) tərəfindən təşkil olunan məclislərdə xətiblərə məclisdə hətta onun adını (çəkməmələrini tapşırardı.(١

Əvvəllər Ayətullah Behcət istixarə etmək üçün məsciddə oturar və Qur`anla istixarə edərdi. İstixarənin cavabını isə işarə ilə deyərdi. Amma indi cismən gümrah olmadığına görə öz evində istixarə edir və onları məxsus dəftərdə qeydə alır. Bu dəftərin vərəqləri ən ucuz kağızdan hazırlanmışdır. Dəftər dolanda Behcət üçün ağ vərəqləri olan jurnal tipli dəftər alıb apardıq. O dəftərə baxıb nə isə fikirləşib dedi: "Bu dəftər mənim işim ".üçün münasib deyil. Gərək sarı, ucuz kağızdan olsun

Biz bu dəftəri saxladıq ki, bir gün lazım olar. Bir gün onun öz dərslərini qeyd etdiyi dəftəri qurtardı. Həmin saxladığımız dəftəri ona verəndə yenə də qəbul etmədi. Çox ,israr və müxtəlif dəlillər gətirəndən sonra deyəndə ki



---

١- [٣٩] "Cüzveyi nəzəri və qozəri bər zendeqaniye Ayətullah Behcət"

sizin yazılarınızı başqa dəftərlərdə oxumaq çox çətin olur və aradan gedir – o vaxt .razılaşdı

Belə incəliklərə diqqət yetirmək bə`zən bizim üçün dərk edilməz olsa da, ilahi .insanların kamala çatmasında mühüm rolu olmuşdur

**?Qadını da həyatdan məhrum etmək olarmı**

Bir gün çox imanlı dostlardan biri belə nəql edirdi: “Bir dəfə Behcəti yuxuda gördüyüm zaman mənə tapşırdı ki, xanımına elm öyrət. Bir müddət keçəndən sonra gördüyüm yuxunu ona (Behcətə) danışanda, buyurdu: “Qadının elm öyrənməyinin qarşısını ”.almağa bizim heç bir haqqımız yoxdur

Əgər elmin tədrisi qadınlara məhrəm olan şəxslər vasitəsilə olsa, daha yaxşıdır. Əsas məsələ qadınların vacibata əməl etmələridir. Əlbəttə, kişilərin də qadınlar kimi vacibata riayət etmələri çox mühümdür. Sonra belə buyurdu: “Elm həyat deməkdir. Məgər qadını da həyatdan məhrum etmək olarmı?” Sözünü bə`zi alimlərin xanım və qızlarının çatdığı məqamlara işarə etməklə davam etdirdi. Axund Molla Əli Həmədanidən nəql edərək dedi: “O öz qızlarını Nəcəf-Əşrəfə aparmaq şərtilə ərə ”.verirdi ki, orada təhsil ala bilsinlər

**Keçmiş günlərin həsrətində**

Behcət həmişə dünyasını dəyişmiş, əbədiyyətə qovuşan böyük alimləri və onların necə həyat sürmələrini çox həsrətlə yad edərdi. Bir gün yenə onlardan söz düşəndə, dedi: “Biz əvvəlki alimlərin getdiyi düz yolu getmirik.” Sonra dərindən ah çəkərək əlavə etdi: “Bilmirəm niyə belədir? Ayətullah Qazi öz ustadının dilindən belə nəql edir: “Bir vaxtlar Həzrət Əlinin (ə) hərəmində gecə namazlarının qunutunda “Əbu Həmzə Sumali” duasını oxuyan yetmiş nəfər böyük şəxsiyyət var idi. Qazi deyərdi: “Bizim dövrümüzdə bu cür adamlar üç-dörd nəfərdən çox deyil.” Amma biz öz zamanımızda hələ belə

adamlardan birini də görməmişik. Hal-hazırda da vəziyyətin necə olduğunu .görürsünüz

**?Hanı əməl edən**

Bir dəfə tələbələrdən biri Behcətin yanına gedib deyir: Bizə əməl etmək üçün xüsusi dini tapşırıq verin. Behcət buyurur: “Tapşırıq? Tapşırığa əməl edən hanı?” Tələbə xahiş edir ki, heç olmasa bizə nəsihət və dua edin. O belə cavab verir: “Dua edirik. Dua ki, bir şey deyil.” Tələbə yenə deyir: İndi də bizə bir tapşırıq verin. Behcət buyurur: “Sizə deyəcəyim tək bir kəlamı eşidin və qulağınızdan sırğa edin: “Hara gedirsiniz gedin, ”.amma günah etməyin

**?Seyri–sülukda niyə şagird qəbul etmirsiniz**

Höccətül-islam Ənsari Həmədani belə nəql edir: Nəcəf-Əşrəfdə olduğum vaxt bir gün Ayətullah Behcətdən soruşdum: “İrfan” və “Seyri-süluk” yolunda yetişdirmək üçün niyə şagird qəbul etmirsiniz? Dedi: “Çərşənbə axşamı Səhlə məscidinə get. Orada gördüklərinin hamısını mənə danışandan sonra sənin sualına cavab verəcəyəm.” Behcətin dediyi kimi həftənin çərşənbə axşamı Səhlə məscidinə getdim. Məsciddə adam çox idi. Qoca-cavan, hər kəs bir cür Allahla münacat etməyə məşğul idi. Gecə yarısına yaxın məscid yavaş-yavaş boşalmağa başladı. Barmaqla sayılası və uzun-uzadı gecə namazı qılan bir-neçə qocadan başqa məsciddə bir adam qalmadı. Behcətin yanına gedib məsciddə gördüklərimi ona danışdım. O cavabında belə dedi: “Şagird qəbul etməməyimin əsas səbəbi, ibadətdə möhkəm adam tapa (.bilməməyimdir.” (Adamların çoxu ağır ibadətə tab gətirə bilmirlər

**Ayətullah Behcətin gündəlik proqramı**

Onun gündəlik proqramı həmişə xüsusi nizam üzrədir. Mərcəi-təqlid olmazdan əvvəl və ya sonra onun bu proqramlarında heç bir dəyişiklik baş verməyib. Behcət vaxtını ibadət, zikr, təfəkkür, mütaliə, tədris etməklə və ya

vacib məişət işlərini görməklə keçirər. Tarix boyu böyük dini şəxsiyyətlər ömürlərinin .hər anından səmərəli istifadə etməyə çalışmışlar

Hər gün sübh azanından bir-iki saat qabaq yuxudan durub ibadətlə məşğul olar və fürsət tapanda mütaliə edər. Namazını əvvəl vaxtında öz mənzilində qılar, bir az keçəndən sonra isə camaat namazı qılmaq üçün məscidə gedər. Camaat namazından sonra xüsusi təqibatı yerinə yetirib hərəmə yollanar, təqribən saat ۹۳۰-da evə qayıdar. On-on beş dəqiqə oturub dincini alandan sonra tədris etmək üçün “Fatimiyyə” məscidinə gedər. Dərsdən sonra bir az mütaliə edib, camaat namazı qılmağa hazırlaşar, namazdan sonra müraciət edənləri qəbul edər, sonra isə nahar yeməyini yeyər. Günün qısa və uzun olmasını nəzərə alaraq bir-iki saat istirahət edəndən sonra yenə tədris etmək üçün məscidə yollanar və dərsdən sonra fasiləsiz şam namazına hazırlaşar. Evə qayıdan zaman qaranlıq bir otaqda namazdan sonrakı xüsusi ibadətləri yerinə yetirər, bir stəkan çay içib, mütaliə ilə məşğul olar və sonra isə şam yeməyini (yeyib istirahət edər.(۱

## Yemək proqramı

Ayətullah Behcət həftə ərzində bir-iki dəfədən artıq ət yeməyi yeməzmiş. Baxmayaraq ki, bə`zi yerlərdə kabab və başqa yeməklər yeməyə tövsiyə edilmişdir. Səhərlər pendir, çay, çörək və ya bir stəkan süd, axşamlar isə çay-çörək meyl edər. Əlbəttə, əvvəllər axşam ayran-çörək yeyərdi, amma ağır xəstələndikdən sonra həkim ayranı qadağan etmişdir. Bundan sonra o, gecələr limon şərbətilə çörək yeyər. Mədə (ağrıları baş verəndən sonra bu yemək proqramını da dəyişib.(۲



---

.Ağa Behcətin ailə üzvlərindən biri ilə söhbətdən [۴۰] -۱

Qohumlarından biri ilə söhbətdən. Yeri gəlmişkən onu da qeyd edim ki, ibadət, [۴۱] -۲ yemək və istirahət proqramları onun (Behcət) özünə məxsusdur. Başqaları, o cümlədən də cavanlar ruhlarının şad olması üçün sağlam istirahətə möhtacdırlar. Həmçinin bu çətin yolu keçmək üçün sağlam və güclü bədənə malik olmalıdırlar. Bir neçə mərhələni keçdikdən sonra bu proqramları icra etmək qabiliyyəti əldə edirlər.

Müvəffəq olmaq istəyən hər bir şəxs bu yolu keçmiş təcrübəli bir ustadın verdiyi xüsusi .tapşırıqlara əməl etməsi gərəkdir

## Sübh namazını gec qılmağın səbəbi

Ayətullah Behcət həmişə sübh namazını əvvəl vaxtında öz mənzilində qılandan sonra, camaat namazı qılmaq üçün məscidə gedərdi. Behcətin camaat namazında iştirak edənlərdən bə`ziləri uzaq yerdən gəldikləri üçün ondan namazı bir az gec qılmasını xahiş etmişdilər. Onların xahişinə görə daha sübh namazını da bir az gec qılar. İran inqilabından sonra yaranan vəziyyətə görə İmam Xomeyni onun üçün cangüdən qoymaq istəyir. Amma Behcət cavabında "cangüdəni qoruyan Allah, bizi də hifz edər"– deyib, İmamın bu təklifini qəbul etmir. Tehrandan belə sifariş gəldi: "Çalışın qaranlıqda evdən çölə çıxmayın." Behcət bu sifarişdən sonra həmişə məscidə də bir az gec gedər. .Bu da onun sübh namazını gec qılmasının başqa bir səbəbi idi

Amma günorta namazının dəqiq vaxtını bilən kimi, namaza hazırlaşar. O öz həyətində üfüqi bir xətt düzəltmişdir. O bu üfüqi xətlə zöhr namazının şər`i vaxtını dəqiq tə`yin (edir.(۱

## Məhbubla münacat

Ayətullah Şeyx Cavad Kərbəlayi deyir: Ayətullah Behcət gecə namazına və gecə yarısı ibadətlərinə xüsusi əhəmiyyət verər. Xüsusilə də cümə axşamlarında münacat etməyi çox üstün tutar. Tanınmış alimlərdən biri mənə dedi: "Nəcəf-Əşrəfdə olduğum vaxtlar idi. Bir dəfə cümə axşamı gecə yarısı Seyyidin mədrəsəsində Behcətin səcdə halında həzin səslə ağlayaraq



---

.Yaxın qohumlarından biri ilə söhbətdən [۴۲] -۱

bu cümləni təkrar etdiyini gördüm: “İlahi, mənli ğəyruk, əs`əluhu kəşfə zurri vən-(nəzərə fi əmri.” (۱)

**Ayətəl kürsi və onun tə`sirləri**

:Cənab Zahidi məktublarının birində belə nəql edirdi

Kərəminijadın xahişinə əsasən, dostlardan birinin Behcət haqqında nəql etdiyi bir“ əhvalatı sizin üçün yazıram. Ümidvaram bu əhvalat mö`minlərin ürəyincə olsun, .inşallah

Qum elmi hövzəsinin fazil şəxslərindən Urumiyə şəhərindən olan Mirzə Yusif başına“ gələn qəribə bir əhvalatı mənim üçün danışaraq dedi: Bir-iki il olardı ki, təhsil almaq üçün Qum elmi hövzəsinə gəlmişdim. Çoxlu dərs və mütaliə nəticəsində gözlərim ağrımağa başladı. Artıq üzbəüzdəki şeyləri görə bilirdim. Yavaş-yavaş ağrılarım şiddətlənməyə başladı. Qum şəhərindəki göz həkimlərinin əlindən bir şey gəlmədiyinə görə məni Tehrana göndərdilər. Tehrandakı mütəxəssis həkim gözlərimi müayinə edəndən sonra bir iynə vurdu və gözlərim sağalmağa başladı. Bir-iki aydan sonra yenə həmin xəstəlik üzə çıxdı. Əvvəl yanına getdiyim həkimin yanına getdim və yenə bir iynə vurdu. Bu dəfə iki-üç həftədən sonr yenə həmin ağrılar başladıqda həkimə müraciə etdim. Həminki kimi iynə vurub ağrılarımı sakitləşdirdi. Artıq bu dəfə iki-üç gün keçməmiş gözüm əvvəlkindən qat-qat şiddətli ağrımağa başladı. Həkim artıq heç bir şey edə bilmədi. Dəfələrlə aparılan müayinələrdən sonra həkimlər mənim bu xəstəliyimin əlacsız olduğunu dedilər. Mən dedim: Əgər xarici ölkələrdə bu xəstəliyi müalicə



---

Bərgi əz dəftəre aftab”, Rza Baqirzadə, səh. ۵۰-۵۱“ [۴۳] -۱

edə bilərlərsə, mən getməyə hazıram. Amma həkimlər qəti olaraq dedilər: “Bu xəstəliyin müalicəsi yoxdur.” Naümid halda Quma qayıtdım. Məsciddə Ayətullah Behcət ilə namaz qılandan sonra onun ardınca getdim. Sualı olan hər kəs cavabını alıb gedəndən sonra mənim də sual edəcəyimi başa düşüb dedi: “Buyur, sözünü de.” Kədər məni boğa-boğa başıma gələnləri Behcətə danışdım. Gülümsünüb dedi: “Gündəlik vacibi namazlardan sonra əllərini gözlərinin üstünə qoy və bir Ayətəl kürsi oxu. Sonra ”!bu cümləni de: “Allahum-məhfəz hədəqəti bihəqqi hədəqətəy Əli ibn Əbi Talib

Mirzə Yusif deyir: Altı-yeddi gün mən Behcətin dediyi tapşırığa əməl etdim və gözlərim tamamilə sağaldı. Həmin hadisədən on iki-on üç il keçməsinə və gecə-gündüz mütaliə .etməyimə baxmayaraq həmin xəstəlikdən əsər-əlamət də yoxdur

**”.Peyğəmbərsayağı əxlaq“**

Tehran alimlərindan biri belə nəql edirdi: Bir gün Ayətullah Behcətin mənzilinə getmişdim. Qapını çox sadə bir qoca kişi açdı. Dedim: Ayətullah Behcətlə işim var. Həmin yaşlı kişi dedi: “Buyurun.” Dedim ki, onun özü ilə işim var. Yenə cavab verdi: “Buyurun.” Mən o şəxsin Behcət olduğunu güman belə etməzdim. Öz-özümə fikirləşdim ki, yəqin onunla görüşməyə icazə vermirlər. Sözümü demədən geri qayıtdım. Bir dəfə onun camaat namazında iştirak etmək üçün məscidə gedəndə qapını açan şəxsin Ayətullah Behcət olduğu mənim üçün aşkar oldu. O zahirdə adi adamlardan heç seçilmir. Ağa Behcətin bu əməli Peyğəmbərə xas olan əxlaq və (rəftarını mənim zehnimdə canlandırdı.(١

**Ayətullah Behcətin dostlara diqqəti**

İmanlı tələbələrdən biri gördüyü sadiq röyanı (yuxu) belə danışır: Yuxuda Ərdəbildə bir şəxsin can verdiyini gördüm. Yuxu aləmində həmin şəxsi



---

١- [۴۴] ”Cüzveyi nəzəri və qozəri bər zendeqaniye Ayətullah Behcət“

tanıdım. Elə bu vaxt Behcətin Qumda məsciddə oturub istixarə etdiyini gördüm. Birdən Behcət Ərdəbildə can verən şəxsin halından xəbərdar oldu. Dərhal özünü həmin şəxsə çatdırıb onu müalicə etməyə başladı. Can verən şəxsin yanındakılar Behcəti görmürdülər. Ustadımın(١) yanına gedib gördüyüm yuxunu ona danışdım. O dedi: “Doğrudan da bu cürdür. Ayətullah Behcət kimi böyük şəxsiyyətlər onlara məhəbbəti olan adamlara xüsusi qayğı göstərirlər. Yuxuda gördüyün şəxsin ihtizar (can verən) ”.halı, onun mə`nəvi cəhətdən zəifləməsi idi ki, Behcət ona köməyə getmişdir

### İmam Xomeynini xatırlarkən

İmam Xomeyninin Ayətullah Behcətə xüsusi rəğbəti vardı. Behcətin Quma gəldiyi ilk vaxtdan İmam Xomeyni onunla get-gəl əlaqəsi yaradan birinci şəxs idi. İmam Xomeyninin Əllamə Qazi haqqında soruşduğu suallar əsnasında Behcət onun da “seyri-süluk” məqamında olduğunu dərk edir. Behcətin imamla rabitəsi o qədər yaxın idi ki, hətta müsafirətə getdiyi vaxt yanında olan əmanətləri İmam Xomeyniyə .tapşırardı

İmam Xomeyni sürgündə olan vaxtı Qumda olduğu üç il müddətində məşğuliyyətinin çox olmasına baxmayaraq, vaxt tapan kimi Behcəti görməyə gedərdi. O bu müddət .ərzində təqribən səkkiz dəfə onunla görüşmüşdü

### Sadiq yuxu

Ayətullah Behcətə xas sevgisi olan və onun dərslərindən bəhrələnən bir şəxs belə nəql :edir

Ağa Behcətin İmam Xomeyni ilə necə əlaqə saxlaması sualı uzun müddət mənim zehnimdə həkk olmuşdu. İmam Xomeyninin çoxlarını məsləhət almaq üçün Behcətin yanına göndərdiyini eşitmişdim. Bir dəfə ramazan ayının onuncu gecəsi İmam Xomeynini yuxuda gördüm. Ondan Behcətlə olan rabitəsi barədə

səh:۶۶

---

١- [۴۵] Bu şəxs Qumun əxlaq və mənəviyyat alimlərindən biridir.

soruşanda belə cavab verdi: “Mən onunla qırx il bundan əvvəl, oğlum Mustafanın doğulduğu tarixdən bəri tanışam.” Dedim: Deyilənə görə siz Behcət haqqında belə bir söz demisiniz: “Gedin Behcətin namazında iştirak edin. Namaz halında ona ilahidən feyz inayət olur ki, siz də o feyzə şərik olun.” İmam dedi: “Eynilə bu cümləni yox, amma bu məzmunda bir şey demişəm.” Elə bu vaxt yuxudan ayıldım. Bir müddət sonra Behcətin yanına gedəndə İmam Xomeyni haqqında xəbər söylədi. Mən gördüyüm yuxunu Behcətə danışdım. O bunu təsdiq edib dedi: “Bəli, tamamilə doğrudur.”

**Bu şəxsə ehtiramı vacib bilirəm.**

İmam Xomeyninin şagirdlərindən olan Ayətullah Xaifi öz xatirələrinin birində belə nəql edir: “١٩٥٨-ci ildə İmam Xomeyni zindandan azad olub Quma gəldi. Qum şəhərinin bütün məhəllələri İmamın gəlişini bayram edirdi. İmamın Qumdakı mənzili hər gün adamla dolu olardı. Hər gün İmam Xomeyninin görüşünə gələnlərdən biri də Behcət idi. O, hücrələrdən birinin qapısı ağzında ayaq üstə bir az dayandıqdan sonra qayıdıb gedərdi. Ona deyəndə ki, sizin kimi böyük bir şəxsiyyətin burada durması yaxşı deyil, heç olmasa keçib içəridə əyləşin. Behcət belə cavab verərdi: “Mən bu böyük şəxsiyyətə hörmət əlaməti olaraq hər gün bura gəlib onun hüzurunda bir-neçə dəqiqə ayaq üstə durmağı özümə borc bilirəm.”(١)



---

١- [٤٦] “Dine ma uləmaye ma”, Məhəmməd Mehdi Tac Ləngərudi (vaiz), səh. ١٠٨

## Bil ki, sadə bir tələbə övladısan

Ayətullah Behcətin oğlu belə bir əhvalat nəql edir: “Mənim kiçik uşağım hələ yazıb-oxumağı bilmədiyi vaxt, bə`zən mənim iş otağıma gələr, özü üçün dəftərində nə isə cızma-qara edərdi. Bir dəfə dəftərində çəkdiyi xətləri babasına (Behcət) göstərəndə, babası ondan soruşur ki, burada nə yazmısan? Uşaq deyir: “Bu sirri ancaq özüm bilirəm.” Atam deyir ki, indi yazdıqlarını mənim üçün oxu. Uşaq oxumağa başlayır və orada bu cümləni işlədir: “Həzrət Ayətullah-Üzma Behcət...” Atam bunu eşidəndə çox narahat olur, amma uşağa bir söz demir. Sonra məni otağına çağırıb çox narahat halda belə dedi: “Sən özünü nə hesab edirsən et, amma bunu bil ki, sadə bir tələbənin övladısan.” Dedim: Ağa, nə olub? Niyə narahatsınız? Buyurdu: “Bax gör övladın nə deyir? Bu nə ləqəblərdir ki, uşağa öyrətmisiniz?” Dedim: Mən ona heç bir şey öyrətməmişəm. Narahat halda dedi: “Sənin övladındır, tərbiyəsi ilə də sən ”.maraqlanmalısan

Xülasə, Ayətullah Behcət həmişə ad-sandan, şan-şöhrətdən qaçar və belə hallara .qarşı çox həssasdır

## İndoneziyalı qadının hidayət olunması

:Qum elmi hövzəsindəki xarici tələbələrin ustadlarından biri belə nəql edir

Xarici tələbələrdən biri indoneziyalı cavan bir qadın haqqında (indi tələbədir) mənim üçün belə danışdı: “O qadın deyir ki, İrana gəlməzdən əvvəl yuxuda Behcət adlı bir şəxsin mənimlə söhbət etdiyini gördüm. Bu nurani şəxsin söhbətləri mənə böyük tə`sir etdi. Gördüyüm bu yuxudan sonra İrana gedib həmin ilahi şəxsi görmək arzusunda idim. İrana gəldiyim vaxt birbaşa Qum şəhərinə yollandım. Behcəti görmək üçün həmişə camaat namazı qıldığı məscidə getdim. Onu (Behcət) görəndə yuxudakı şəxsin elə özü olduğu mənim üçün aydınlaşdı. Təhsil üçün Qum şəhərinə gələn bu indoneziyalı xanım namazdan sonra Behcətin yanına gedir. Behcət başqalarıyla çox az .hallarda söhbət etməsinə baxmayaraq bu xanımla bir az söhbət edir

Allah-təala bu qəlbi nurlu şəxsin kölgəsini İslam ümmətinin başı üstündən əskik .etməsin

**Aza qane insan**

Behcət heç vaxt vücuhatdan (beytül mal) istifadə etmirdi. Ailəsinin xərcini İranın şimalındakı ata irsi olan əkin sahələrindən ödəyirdi. Şah zamanında torpaq islahatları aparılarkən bu preses onun torpaqlarına aid olmadı. Buna baxmayaraq bu islahatlar zamanı onun torpaqlarının bir qismi əldən çıxdı. Qalan torpaqları da başqa bəhanələrlə ondan aldılar. Maraqlısı budur ki, Behcət bu torpaqlar əldən çıxmazdan əvvəl bu haqda qabaqcadan xəbər vermişdi. O vaxtlar deyirdi: "Şah yalan deyir, bütün torpaqları alacaq." Məhəmməd Əraqinin atası deyir: "Mən bu sözü eşidəndə gedib bütün torpaqlarımı satdım. Amma mənim üçün çox təəccüblü idi ki, o bunları qabaqcadan ".bilə-bilə özü üçün bir şey etmədi. Həmin vaxtlar onun ailəsi çox çətinlik çəkirdi

Ağır maddi durumda olduğu günlərin birində bir şəxs Behcət üçün min tümən pul gətirdi. O şəxs başqa müctəhidin müqəllidi idi. Bu həmin pullara gözucu belə baxmadı. Bu macəranın şahidi olduğuma görə mənimlə əhd bağladı ki, əgər bu haqda bir söz deməsən sənə bir şey verəcəyəm. Mən onunla razılaşdım. Behcət bu pulları həmin şəxsin təqlid etdiyi mərcəi-təqlid üçün göndərdi. Bu əhvalatdan bir müddət keçəndən sonra Behcətə dedim: Ağa, mənə verdiyiniz söz nə oldu? O belə cavab verdi: "Məgər verdiyim söz üçün müəyyən vaxt tə`yin eləmişdim? Hələ ki, gecikməyib. Gəl o xalçanın (kənarını qaldır." Xalçanın altında tümən var idi. Mənə dedi: "O pulu götür."(١)

Ayətullah Behcətin oğlu belə nəql edir: Atamızdan bir şey istəyəndə, heç vaxt yox deməzdi. Amma xüsusi bir tərzdə bizim fikrimizi istədiyimiz şeydən yayındırardı. Yadımdadır, bir dəfə dondurma almaq üçün ondan pul istədim. Mənə dedi: "Yandırma istəmirsən?" Bir az keçəndən sonra yenə ondan pul istədim. Bu



---

.Ayətullah Behcətin dəftərində işləyənlərdən biri ilə müsahibədən [۴۷] -١

dəfə dedim: Eybi yox, pul ver gedib yandırma alım. Dedi: “Yandırmanı ki, satmırlar.” .Nəhayət, çox hazırcavablıqla öz sözünü sona çatdırardı

## Şəfaverici zəmzəm

:Höccətül-islam İsfəndiyaridən belə nəql olunur

Bizim yaxın qohumlarımızdan biri xərçəng xəstəliyinə tutulmuşdu. Həkimlər deyirdi ki, gərək tezliklə əməliyyat olunsun. Yoxsa xərçəng (şişi) bütün bədəninə yayılacaq və onu da müalicə etmək qeyri-mümkündür. Bu ağır şəraitdə xəstənin yaxın adamları nə edəcəklərini bilmirlər. Elə buna görə də Behcətin yanına gedib cərrahiyyə əməliyyatı olunması barədə istixarə etdirirlər. Behcət istixarə edib deyir: “Cərrahiyyə əməliyyat lazım deyil.” Sonra bir miqdar pul xəstənin yaxın adamlarına verir ki, onun (xəstə) adından sədəqə versinlər. Zəmzəm suyunu İmam Hüseynin (ə) türbəti ilə qarışdırıb hər gün müəyyən qədər xəstəyə vermələrini və yoxsullara yemək verməyi tapşırır. Həmçinin hər nə qədər bacarırlarsa, yoxsullara sədəqə verməyi və onlardan bu .xəstəliyin sağalması üçün dua etmələrini istəmələrini tapşırır

Xəstənin qohumları vaxtı əldən vermədən onun tapşırıqlarını yerinə yetirməyə başlayırlar. Həmin xəstə qadını Əhli-beytə (ə) təvəssül etmək niyyətilə Məşhədə aparırlar. Bu xəstə qadın üç gün İmam Rzanın (ə) hərəmində ibadət və münacatla .məşğul olduğu vaxt, onda bir çox mə`nəvi-ruhi hallar baş verir

Məşhəddən qayıdandan sonra, artıq xəstənin ağrıları yox idi. Biz olanları danışmaq üçün Behcətin evinə yollandıq. Onunla məsciddən evinə qayıdarkən yolda rastlaşdıq. Bizi görüb soruşdu: “Xəstənizin halı necədir?” Dedik: Əlhəmdülillah və bütün baş verənləri ona ərz etdik. Buyurdu: “Həmin taşırıqlara əməl edin və xəstəni müayinə ”.olunması üçün həkimin yanına aparın

Həkim xəstəni müayinə edib təəccüblə ondan soruşdu: Siz müalicə üçün harasa getmişdinizmi? Xəstə deyir: Necə məgər? Həkim deyir: Ay xanım, sizin xəstəliyiniz inanılmaz dərəcədə azalmış və cərrahiyyə əməliyyatına

ehtiyac yoxdur. Bədəninizdə olan şiş o qədər kiçilmişdir ki, onu da dərmanla müalicə (edərik.(١

**Ayətullah Cavadi Amulinin Behcətə münasibəti**

cu ildə Ayətullah Cavadi öz təfsir dərslərinin birində buyurdu: "Biz çox vaxt Əllamə-١٩٨٩ Təbatəbaiyə deyərdik: "Bizə əxlaq dərsi de. O cavabında belə deyərdi: "Əxlaq deyiləsi yox, əməl ediləsidir və əxlaqa əməl etmək lazımdır. Sizin tanıdığınız bu Behcətin bütün həyatı, başqalarıyla get-gəli və onlara qarşı olan münasibəti bütünlüklə əxlaq dərsidir. ".Başqa fəqihlər kimi dərs deyər və digər pişnamazlar kimi camaat namazı qılar

Behcətin mə`nəviyyatla dolu olan camaat namazını bə`zən onun həzin ağlamaq səsi bu mə`nəviyyatı birə on artırır. Hərdən Ayətullah Behcətin bu həzin səsi namaz qılanların ağlamaq səsilə qarışır. Onun namazında iştirak edənlərin ruhu qanad açır və gözlər yaşla dolur. Ürəklər dolmuş buluda bənzəyir və göz yaşları səccadələrə tökülür. Çox vaxt onun camaat namazı qıldığı məsciddə namaz qılmaq üçün çoxlarına yer .olmur

Onun namazından feyz almaq üçün yaxından-uzaqdan gələnlərin çoxu məsciddə yer (olmadığından oranı tərk etmək məcburiyyətində qalırlar.(٢

Günlər içərisində cümə axşamları onun namazı başqa gecələrdən çox fərqli olur. Behcət "xiftən" namazının birinci rəkətində "Cümə" və ikinci rəkətində isə "ə`la" surələrini oxuyur. "Onlara de ki, sizin qaçdığınız ölüm mütləq sizi haqlayacaq və sonra isə zahir və qeybdən xəbərdar olanın hüzuruna aparılacaqsınız. O vaxt sizə əməlləriniz barədə mə`lumat veriləcəkdir." və "Sonra orada nə ölərlər, nə də dirilərlər." ayələrinə çatanda, ürəyi Allah eşqilə yanan arifin ağlamaq səsi ucalır. Namaz qılanların da .ağlamaq səsi onun səsinə qarışaraq məscidə ruhani bir aləm bəxş edir



---

.Bərgi əz aftab", Rza Baqirzadə, səh. ٥٩-٦٠, cüz`i dəyişikliklə" [٤٨] -١
".Cüzveyi nəzəri və qozəri bər zendeqaniye Ayətullah Behcət" [٤٩] -٢

Bir dəfə Əllamə Təbatəbaidən soruşdum: Siz əxlaqi yöndən Behcəti necə görürsünüz? ".Əllamə dedi: "O zöhd, təqva və əməl sahibidir

Əsas məsələ əməl etməkdir. Gərək həm şagird, həm də ustad əməl əhli olsun. Bir gün Əllamə Təbatəbaidən şagirdlərindən biri onun əxlaq dərsləri haqqında soruşanda belə cavab verdi: "Biri quru-quru danışır, ancaq əməl etmir və bunun heç bir tə`siri yoxdur. ".Eləsi də var ki, əməl sahibidir və insan gərək bu cür şəxsiyyətlərdən bəhrələnsin

Mənim nəzərimcə "ustad tapa bilmirik"– deyənlər üçün heç bir bəhanə yeri yoxdur. Ustad nə qədər istəsək var. Əsas problem ustadın olmamağı deyil. Mühüm olan əməldir. Heç kim deyə bilməz ki, ay Allah mənim ustadım olmadığı üçün Ağa Mirzə .Cavad Məliki, Əllamə Təbatəbai, Ayətullah Behcət, İmam Xomeyni kimi ola bilmədim

Behcəti tanıdığım bu uzun müddət ərzində bir neçə dəfə ona ərz etdim: Ağa, əgər mümkünsə bizi öz əxlaq şagirdlərinizin sırasına qəbul edin. Hər dəfə onun verdiyi cavabın mənə böyük köməyi və xeyiri oldu. Deyirdim: Ağa, sizin hüzurunuzdan bəhrələnmək üçün vaxtınız varmı? Həmişə verdiyi mühüm cavablardan biri də bu idi: "Nə halım var, nə vaxtım." Bizi görmək istəyən hər kəs namaz və rövzə(١) məclisinə ".gəlsin. İnşallah, bir şeylər öyrənər

Ayətullah Behcət "Nə halım var, nə vaxtım" deməsinə baxmayaraq bütün məsələləri bəyan və mənim üçün höccəti tamam etdi. Həm elmi, həm də əxlaqi bəhslərdə söyləmədiyi bir şey qalmadı, getmək istədiyim yolu tamamilə işıqlandırdı. O, bizi rəsmi surətdə şagirdliyə götürməməsinə



---

Camaatın çoxu onunla görüşmək istəyirdi. Behcət həm onlarla görüşmək və [٥٠] -١ həm də vaxtının hədər getməməsi üçün cümə günləri rozə məclisi qurardı. Əvvəllər bu məclis onun evində təşkil olar, amma mənzilinin kiçik və məclisə gələnlərin sayı çox olduğundan, rozə məclisini məsciddə keçirməyə məcbur oldular. Üləma və böyük şəxsiyyətlərin bir çoxu onun bu məclisində iştirak edər və bunu başqalarına da tövsiyə

.baxmayaraq, mə`nəvi baxımdan ehtiyac duyduğum bütün məsələləri aydınlaşdırdı

Əllamə Təbatəbainin hüzuruna getdim və o, rəsmi olaraq məni əxlaq dərslərinə şagirdliyə qəbul etdi. Bunu da deyim ki, Behcətin elmindən və mə`nəviyyat xəzinəsindən aldığım bəhrələr Əllamə Təbatəbainin hüzurunda əldə etdiyim .bəhrələrdən heç də az olmamışdır

Ayətullah Behcət vaxtı olmamasına baxmayaraq əməl sahibi olan hər bir kəsə–istər kiçik, istər böyüyün onun üçün heç fərqi olmadan yol göstərər və hidayət edərdi. Bə`zən ustadın bir dəqiqəlik moizəsi insanı bir ömür hidayət edib, qabağa aparır. Behcət elə bu cür halı və vaxtı olmaya-olmaya, sakit halda çoxlarını haqq yoluna .hidayət edir

Ayətullah Behcət deyir: "Peyğəmbərin gözəl bir cümləsi var ki, buyurub: "Bu dünyanın üç şeyindən xoşum gəlir: Qadın, ətir və namaz. "Bu cümlədən mə`lum olur ki, namazın ".da ləzzəti var. Qadınla evlilikdə olan ləzzət namazda da var

Tanıdığım doxsan yaşlı bir alim həmişə deyərdi: Mən yeməkdən ləzzət almıram. Çünki bir şey yemək boş kisəni doldurmaq kimi bir şeydir. Amma namazdan böyük ləzzət .alıram." Əsas me`yar namazdır

İbadətlər arasında ən üstün və ən şirin zikr namazdır. Bə`ziləri heç kəsin eşitmədiyi xüsusi zikrlər axtarırlar. Bir dəfə yayda İmam Rzanın (ə) ziyarətinə getmək istəyirdim. Əllamə Təbatəbainin hüzuruna gedib dedim: Məşhədə ziyarətə getmək istəyirəm. Gedəcəyim bu müqəddəs məkanda hansı əməli etsəm daha yaxşıdır. Əllamə dedi: "Ən yaxşısı namazdır." Bəndənin Allaha daha yaxın olması üçün bu tapşırığa əməl etməyi .tə`kid edir

Bir gün Behcətdən soruşdum: Sübh namazının tə`qibatları arasında hansı daha əfzəldir? Dedi: "Hamısı yaxşıdır." Fikirləşəndə gördüm ki, doğrudan da bunların hər biri .bir dərdin dərmanıdır

Ağa Behcət Bəhrul-Ülumun fiqhə aid mənzuməsini sanki bütünlükdə əzbər bilir. O bə`zən dərslərində bu şe`rlərdən bir neçə beyt oxuyar və

me`rac haqqında olan bir beyti çox təkrarlayardı. Me`rac istəyənlər üçün ən yaxşısı namazdır. Əlbəttə bu namazı təkmilləşdirmək lazımdır. Behcətin dediyi kimi gərək namazı əməlli-başlı düzəldək. Həmçinin əlavə edərək deyir: “Salman Farsinin qıldığı namazı qılmağımıza hələ çox var.” İmam Xomeynidən şagirdlərindən ikisi onun həftədə bir gün və ya hər gün bir neçə dəqiqə əxlaq dərsi deməsini tə`kidlə istəyəndə İmam buyurdu: “Fəqih olmaq üçün otuz il zəhmət çəkdiyin kimi, adam olmaq üçün də neçə illər əziyyət çəkməlisən. Bir neçə dəqiqəlik əxlaq dərsi kafi deyil. Namazını əməlli-başlı düzəldən şəxs, demək adam olmuşdur. Behcət buyurmuşdur: “İnsanlığın ölçü ”.daşı namazdır

Mən həmişə Behcətin Həzrət Mə`sumənin (ə) hərəmində yarım saat, ۴۵ dəqiqə ayaq üstə durub ziyarət oxumasının şahidi olmuşam. Bu cür namaz və ibadi əməllər onun sahibi olmasının aşkar nümunəsidir. Çox vaxt namazın qunutunda “Əbu Həmzə Sumali” duasını oxuyar. Onun beş yüz dəfə “tövhid” surəsi oxuduğu namazlarından ”.mənim xəbərim var. Bu rəcəb ayının xüsusi namazlarındandır

Bu ibadi proqramlar onun uzun illər əməl etdiyi gündəlik işlərdəndir. Mən başqa .məsələləri deyil, bu proqramları onun kəraməti hesab edirəm

Məşhədin tanınmış şəxslərinin toplaşdığı bir məclisdə olduğum vaxt bir kəramət sahibindən söhbət gedirdi. Dostlardan biri dedi: “Hidayətdən üstün kəramət ola ”.bilməz

”.Qur`anda buyurulur: “Sizlərdən ən kəramətlisi təqvalı olan şəxsdir

Bir dəfə bir şəxs Behcətdən moizə etməsini xahiş edəndə ona dedi: “Deyiləcək moizə həmin sözlərdir ki, böyüklərimiz buyurmuşlar.” Bə`zi vaxtlar ondan nəsihət istəyənlərə belə deyirdi: “İndiyə qədər eşitdiyin nəsihətlərə əməl etmisən?” Bə`ziləri Behcətin yanına gəlib soruşardılar: “Adam olmaq üçün nə etmək lazımdır, yolu nədir?” Behcət deyirdi: “Bizim gördüyümüz işləri siz də görün. Bəli, əgər həqiqətən də əməl

sahibiyiksə, həqiqət sorağındayıqsa, yol budur: Camaat namazına əhəmiyyət vermək, sübh çağı yatmamaq, sübh azanından qabaq oyaq olmaq və sair.”

Bir gün Ayətullah Behcətə dedim: Ağa, ۲۰-۳۰ il tələbəlikdən sonra nə elm, nə də əməl sahəsində heç bir irəliləyiş etməmişəm.” Buyurdu: “Məgər özünü ölçmüsənmi?” Bəli, bir cümlədə mənə cavab verdi. Sonralar bu haqda fikirləşəndə bu cümlənin nə qədər kamil olduğunu başa düşdüm. Əgər yüz il ömür sürsəm belə bu bir cümlə mənə kifayət edər. İnsan öz əməllərini ölçmək üçün namazına fikir verməlidir.

Ayətullah Behcət bir dəfə buyurdu: “Mə`nəvi-əxlaqi cəhətdən çox-çox üstün olan bir ustad öz şagirdlərinə deyərdi: Allaha şükürlər olsun ki, indi biz qeybət etmədiyimizi bu məclisdə çox rahat deyə bilərik. Amma yalanı deyə bilmərəm.”

Ayətullah Behcət boş yerə hər kəsi tə`rifləməz və onun mə`nəvi əxlaqına bu qədər tə`kid etməzdi. Amma bu ustadın kimliyi və neçə ildən sonra öz şagirdlərinə bu sözü deməsi bizim üçün naməlum qaldı. Bəlkə, bu ustad Ayətullah Qazi və şagirdlər isə Əllamə Təbatəbai və Behcət kimi şixsiyyətlər olmuşlar. Bu ustad iyirmi-otuz il nəfsilə cihad edəndən sonra bu sözü demişdir.

Behcət həmişə deyərdi: “Güman etdiyin bir şeyi doğru-dəqiq kimi söyləməyin özü yalandır.” Əllamə Təbatəbai buyurardı: “Öz-özünlə hesab-kitab etməyənə qədər hansı günahlara mürtəkib olduğunu bilməzsən.” Beləliklə, insan özünə rəqib olmasa, yalanın mə`nasını dərk edə bilməz. Bütün bu yazılar Behcətin ömür sərmayəsidir. Bunları dəfələrlə oxuyub bu haqda təfəkkür etməyə dəyər.(۱) Behcət deyir: “İnsan xilqətinin hədəfini (mə`nasını) dərk etmək bir şəxs üçün yetmiş dəfə dirilib yenidən şəhid olmaqdan artıqdır.”(۲)



---

۱- [۵۱] Bu yazılar tapşırıqlar bölümündə daha ətraflı gələcək.

۲- [۵۲] “Fəryadgəre tövhid”

## DÖRDÜNCÜ FƏSİL: Ayətullah Behcətin kəramətləri

### Namazda ruhun təcərrüdü

Ayətullah Seyyid Əli Qazi, Şeyx Məhəmməd Cavad Ənsari Həmədani və rəhmətlik Həddad kimi böyük şəxsiyyətlərin şagirdi olmuş və burada adının çəkilməsinə razı olmayan Nəcəf elmi-dini hövzəsinin müctəhidlərindən biri belə nəql edir: “۱۹۳۹-cu ildə bir qrup adam–Şeyx Məhəmməd Ağa Tehrani, Ayətullah Nəsrullah Mustənbit, Ayətullah Mirzə Əli Həmədani, Ayətullah Seyyid Həsən Şaluy, Ayətullah Behcət, Məşhədi Həsən adlı bir tacir və mən Nəcəfdən Kərbəlaya piyada yola düşdük. O vaxtlar hamımız cavan idik və hətta Ayətullah Behcət hələ evlənməmişdi. Şam və xiftən namazlarını “Səhlə” məscidində qılıb Kərbəlaya yollandıq. Sübh azanına yaxın “Müsəlla” deyilən məntəqəyə çatdıq və hamılıqla sübh namazını Behcətə iqtida etdik. Ağa Behcət namazda “Qədr” surəsini oxudu. Mən camaat namazında ikinci sırada durmuşdum. Bir anlıq onun ruhunun təcərrüd halını müşahidə etdim. Behcətin ruhu qabaqda durub “Qədr” surəsini oxuyurdu və onun bədəni isə ruhuna iqtida edirdi. Biz bu kəraməti səfərdə olduğumuz vaxt Behcətdə müşahidə etdik. Amma o özü səfər (boyu çox sakit halda zikr deməyə məşğul idi.(۱



---

Mirzə Cavad Məliki Təbrizi deyir: “Bir gün ustad Molla Hüseynqulu Həmədani [۵۳] -۱ mənə dedi: “Filan şagirdin əxlaqi tərbiyəsi sizin öhdənizədir.” Bu şagird möhkəm iradəyə malik idi. Seyrü-süluk yolunda altı illik zəhmətdən sonra ruhun təcərrüd halını dərk etmək həddinə çatmışdı. Həmin şagirdi bu feyzə çatdırıb ilahi xələtlə mükafatlandırmaq səadətini öz ustadıma həvalə etmək istədim. Onu özümlə birlikdə ustadımın evinə apardım. Məqsədimi bildirəndən sonra ustadım dedi: “Bu ki, bir şey ”.deyil

### Səhlə məscidində nurun müşahidəsi

Ayətullah Hacı Şeyx Abbas Hatif Quçani buyurur: “Ayətullah Behcət əksər hallarda məsciddə namaz qılar, çox vaxt gecələr sübhə qədər oyaq qalıb ibadətlə məşğul .olardı

Bir dəfə yenə gecə yarısı məsciddə olduğu vaxt dəstəmazını təzələməyə ehtiyac duyur. O heç vaxt məsciddə çıraq yandırmaz və qaranlıqda ibadət edərdi. Dəstəmz almaq üçün məsciddən çıxıb su başına gedir. Birdən bu qaranlıq zülmət içində onda azacıq qorxu hissi yaranır. Onda bu qorxu yaranan vaxt, birdən gözü önündə çırağa bənzər bir nur peyda olur. Bu nur onun önündə hərəkət edir və yolu işıqlandırır. Behcət dəstəmaz alıb qayıdana kimi bu nur onunla gedirdi. Amma o, məsciddə ibadət yerinə (çatanda həmin nur (işıq) yox oldu.(١

### Yuxu halında sualın cavabı

Ayətullah Məhəmməd Təqi Behcət misilsiz arif rəhmətlik Mirzə Əli Ağa Qazi Təbrizinin məşhur şagirdlərindən olmuşdur. Nəcəf-Əşrəfdə təhsil aldığı vaxtlarda onda qəribə mükaşifə və qeybi hallar baş verərdi. Elə tələbəlik illərində sükut və müraqibənin ən .yüksək məqamına nail olmuşdur

Seyyid Əli Ağa Qazinin canişini və hal-hazırda Nəcəf-Əşrəfdə yaşayan Şeyx Abbas Quçani deyirdi: Şeyx Məhəmməd Təqi Behcət fiqh və üsul dərslərini Kompani ləqəbiylə məşhur olan Şeyx Məhəmməd Hüseyn İsfahaninin yanında öyrənmişdir. Behcət dərsdən hücrəsinə qayıdanda dərsə aid bə`zi sualları olan tələbələr onun yanına gedib suallarına cavab alardılar. Əksər hallarda öz hücrəsində yuxuda olduğu vaxt tələbələr ona sual verər və o da ayıq vaxtı olduğu kimi çox aydın və qaneedici cavablar verərdi. Amma yuxudan ayılan zaman səh:٧٧

---

Nure mələkutiye Qur`an”, Hüseyni Tehrani, c. ١, səh. ٢٠۶-٢٠٩-١۴١٠“ [۵۴] -١

ona bu barədə danışanda deyərdi: “Sizin bu dedikləriniz haqqında heç bir şey yadımda deyil.”[1]

### ?Etdiklərini söyləyimmi

Bizim ustadımız həmişə deyərdi: Ariflərin yanına gedəndə ehtiyatlı olun. Çünki onlar sizin batininizi görürlər. Buna misal olaraq dedi: Bir gün bir qoca kişi Behcətin yanına getmişdi. Nəyə görəsə Behcət ona dedi: “Uşaqlıqdan indiyə qədər hansı əməlləri etdiyini bilmək istəyirsənmi? Mən sənin bütün əməllərini bilirəm.”[2]

### Dünyaya bağlılıq

:Tanınmış əxlaq ustadlarından biri Behcətin sirlərdən xəbərdar olması barədə deyirdi

Mənim şagirdlərimdən biri belə nəql edir: Bir müddət olardı ki, qənaət edib pullarımı toplayır və ara-sıra onları sayırdım. Bir dəfə artıq pulların çoxaldığını görüb onları çamadana yığdım. Bir-neçə gün sonra Behcətin hüzuruna getdim. Bizi görüb söhbətə başladı: “Bəli, bu dünya bizi özünə elə bağlayıb ki, buraxmaq belə istəmir. Pullarımızı ”.toplayır, elə hey sayırıq. Onların çoxaldığını görəndə sevinir və sandıqçaya qoyuruq

Bəli, xəlvətdə etdiyim işləri görübmüş kimi hamısını bir-bir söyləyərək, məni əməlli-.başlı tənbeh etdi

### Hədiyyə sahibini tanımaq

Yüksək vəzifəli dövlət adamları tez-tez Behcətlə görüşərdilər. Bir gün yenə dövlət əmniyyət adamlarından biri onunla görüşmək üçün qabaqcadan vaxt almışdı. Həmin şəxs onunla gələn bir-neçə nəfərlə birgə intizar otağında



---

۱- [۵۵] Həmin.

۲- [۵۶] Hövzə ustadlarından birinin yaddaş dəftərindən. Əxlaq ustadının dediklərinə əsasən.

oturub Ağa Behcəti gözləyirdi. Behcət otağa daxil olanda yüksək vəzifəli şəxsdən soruşdu: “Siz haralısınız?” Dedi: Filan şəhərdən. Behcət yenidən soruşanda, həmin şəxsin yanındakılar dedilər: Tehranda işləyir. Behcət dedi: “Ölkədən xaricdə?” Yenə o şəxsin dostları istehza ilə gülümsünərək dedilər: Bu adam Tehranda olur. Birdən həmin şəxs nə isə xatırlayıb dedi: Amerikanı deyirsiniz? Bəli, orada olmuşam. Ayətullah Behcət buyurdu: “Mənim üçün göndərdiyin məktub və hədiyyə hələ də durur.” O şəxs çox təəccüblə dedi: “Ağa, on yeddi ildən sonra bu şey hələ də yadınızdadır! Mən o hədiyyəni tələbə olduğum vaxtlarda sizin üçün göndərmişdim. Axı bu necə ola bilər? Siz ki, məni bu vaxta qədər görməmisiniz? Onun yanındakı adamlar bu sözləri eşidəndə, heyrətə gəlir və bu ilahi şəxs haqqındakı yanlış fikirlərindən xəcalət çəkirlər.(۱)

Ürəyi Allah nuru ilə işıqlanana, neçə illər bundan əvvəl baş vermiş hadisəni və ya üzünü görmədiyi hədiyyə sahibini tanımaq çətin deyil.

### Duanızda israr edin

Nəfsi pak ruhanilərdən biri belə nəql edir: Təqribən ۱۹۸۶-۸۷-ci illərdə işlərimdə bir problem yarandı. Behcətin hüzuruna getdim. Mən hələ bir söz deməmişdim ki, Ağa Behcət problemim haqda danışıb dedi: “Gəl, gəl. Bilirəm nə olub.” Sonra “Xəsaisül-Əimmə” kitabından xüsusi bir tapşırıq verib, buyurdu: “İnşallah problemin həll olar.”

Bu işin üstündən ۲-۳ ay keçdi. Amma o iş düzəlmədi. Bir gün yuxuda Behcəti gördüm ki, deyir: “Yorulmayın. Mən onun yuxuda dediyi kimi edəndən sonra, işlərim qaydasına düşdü.(۲)



---

۱- [۵۷] Ayətullah Behcətin dəftərində (ofisində) işləyənlərdən biri ilə müsahibədən.

۲- [۵۸] Ayətullah Behcətin şagirdlərindən biri ilə müsahibədən.

Qəlbdən gələn Allah kəlamı ildırıma bənzəyir. Bu ildırım insan varlığına od salaraq, paslanmış qəlbləri çirkinliklərdən təmizləyir. Böyük şəxsiyyətlərdən biri buyurmuşdur: Bir gün dostlarla birlikdə Həzrət Əlinin (ə) hərəmində idik. Yorğun olduğumuzdan bir tərəfdə oturub söhbət edirdik. Elə bu vaxt Ayətullah Behcət də hərəmə daxil oldu. Mənə nə isə demək istədiyini başa düşüb ona tərəf getdim. Behcət yaxınlaşıb yavaşca ".qulağıma pıçıldadı: "Biz boş yerə (oynamaq üçün) yaranmamışıq

Onun bu kəlamı sanki bir od kimi ürəyimə sancıldı. Bu inqilabi kəlam məndə böyük bir dəyişikliyə və həqiqət dalınca getməyimə səbəb oldu. Bunun nəticəsində rəhmətlik (Ağa Qazinin dərslərindən bəhrələnmək mənə nəsib oldu.(١

Belə rəvayət olunur ki, həzrət Yəhya uşaq olduğu vaxt həmyaşıdları ona deyərdilər ki, gəl birlikdə oynayaq. Kiçik yaşlı Yəhya deyərmiş: "Heç vaxt. And olsun Allaha ki, biz oynamaq üçün xəlq olmamış, Allah tərəfindən tə`yin olunmuş böyük hədəf üçün yaranmışıq." Amma Ayətullah Behcətin bu sözü dediyi şəxs həm ata, həm də ana tərəfdən iki böyük mərcəi-təqlidin nəslindən olan Ayətullah Seyyid Əbdülkərim Rəzəvi Kəşmiri idi. Ayətullah Kəşmiri "Ürvətul-vüsqa" kitabının müəllifi, Ayətullah-üzma Seyyid Məhəmməd Kazim Təbatəbai Yəzdinin qızının nəvəsidir. O, uzun illər "Kufə" məscidində pişnəmaz olmuşdur və orada hamı onu "istixarəli Seyyid" kimi tanıyırdı. Bu ilahi arif haqqında belə bir əhvalat nəql olunur ki, bir gün şagirdlərindən biri ondan istixarə etməsini xahiş edərdi. Ayətullah Seyyid Məhəmməd Kazim Təbatəbai Yəzdi (istixarəli Seyyid) təsbehlə istixarə edir. Şagirdi ondan Qur`anla istixarə etməsini xahiş ".edəndə, Seyyid deyir: "Təsbehlə də istixarə etsəm, ayəsi mənim üçün mücəssəm olur



---

.Ayətullah Behcətin bu cümləsi həzrət Yəhya peyğəmbərin kəlamıdır [٥٩] -١

Bir gün Ayətullah Həsənzadə Amuli ustadlarından birinin qəbrini ziyarət etmək üçün onunla birlikdə qəbristanlığa getmişdi. Ayətullah Həsənzadə ustadının qəbrinin kənarında durduğu vaxt, onun harada və necə olduğunu görməyi arzulayır. Ayətullah Kəşmiri bunu eşidəndə bir işarə ilə deyir: "Gəl bax." Elə bu vaxt Ayətullah Həsənzadə özünün başqa bir aləmdə olduğunu hiss edir. O aləmdə olduğu vaxt ustadını çox xoşhal və yüksək məqamda görür... Ayətullah Kəmşiri "bəsdir"–deyən kimi o, əvvəlki .halına qayıdır

Hacı Şeyx Əhməd Sibəveyh deyirdi: "Ayətullah Seyyid Əbdülkərim Kəşmiri həmişə ağlar halda olardı. Mən rövzə oxuduğum vaxt adətən minbərin arxa tərəfində oturub Əli-beytə (ə) ağlayardı. İrana gəlməmişdən qabaq onun yanına gedib istixarə etdirdim. Ayətullah Kəşmiri dedi: "Gedin Tehrana, hər şey yaxşı olacaq." Dedim ki, bəs ev işini ".neyləyim? Kəşmiri buyurdu: "Sən get Tehrana, ev işin də düzələcək

Doğrudan da Ayətullah Kəşmiri deyən kimi oldu. Tehrana gələn kimi ev işim də düzəldi. Hal-hazırda da elə həmin evdə yaşayıram. Sonra Nəcəfdəki evimi satıb, buradakı evin .pulunu ödədim

Şeyx Məhəmməd Təqi Ənsari Həmədani buyurmuşdur: İmam Xomeyni Nəcəf-Əşrəfdə olduğu vaxtlar, onun oğlu Mustafa Xomeyni Ayətullah Kəşmirinin xüsusi əxlaq dərslərinə gedərdi. O öz ustadından İmam Xomeyni üçün çox danışardı. İmam buyurur: "Dediklərin doğrudur, amma mən dəlil istəyirəm. Get, Ayətullah Kəşmiriyə de ki, mən filan tarixdə nə yuxu görmüşəm?" Mustafa bunları ustadına ərz edəndə Ayətullah Kəşmiri deyir: "Atana de ki, həmin vaxt yuxuda rəhmətə getdiyini görmüsən. Cəsədini qəbrə qoyanda başının altındakı bir daş sənə əziyyət edirdi. Həzrət Əli (ə) gəlib başının altındakı o daşı götürdü." Mustafa ustadının dediklərini atasına danışır. İmam Xomeyni buyurur: "Tamamilə doğrudur. İndi isə get ondan yuxunun tə`birini də soruş." Mustafa Xomeyni yenə də ustadının hüzuruna gəlib atasının sifarişini ona çatdırır. Ayətullah Kəşmiri belə deyir: "Atana deyərsən Nəcəf sizin üçün qəbir misalındadır. Həmin daş işlərinizdə yaranan maneələrdir ki, inşallah həzrət

Əlinin (ə) yardımı ilə bu problemlər həll olacaq. İrana qayıdacaq və məqsədinizə (çatacaqsınız. İranda da rəhmətə gedəcəksiniz.(١)

Ayətullah Kəşmiri Behcətin sözündən sonra əvvəlcə Ayətullah Quçaninin yanına gedir. O, Ayətullah Quçaninin verdiyi xüsusi tapşırıqlara və “Vadiüs-səlam”da bə`zi ibadətlərə əməl edir. Ağa Qazinin ömrünün son dörd ilini həmişə yanında olar və onun mə`nəvi-əxlaqi elmindən bəhrələnməyə çalışardı. Əllamə Qazi rəhmətə gedəndən .sonra çox vaxt onun məzarı üstə gedər və hətta bə`zi gecələr orada qalardı

Ondan “indiyə qədər İmam Zamanı görmüsünüz”–deyə soruşanda bir söz demədi. Sonra belə ərz etdi: “Bir dəfə Vadiüs-səlamda olanda üç nurani şəxs mənə yaxınlaşıb .dedi: “Sizdən dua etmənizi xaşih edirik” və birdən qeyb oldular

Ayətullah Kəşmiri sükut ixtiyar etməkdə xariqüladə istedada malik idi. Öhdəsindəki .vacibata əməl etməkdən başqa bir iş görməzdi

Ayətullah Seyyid Əbdülkərim Rəzəvi Kəşmiri ١٩٩٩-cu ildə əbədi dünyaya qovuşaraq həqiqət sorağında olanların qəlblərini öz matəmilə yasa qərq etdi. O, həzrət Mə`sumənin (ə) hərəmindəki “Şəhid Mütəhhəri” məscidində Əllamə Təbatəbainin .qəbrinin kənarında dəfn olunmuşdur

**Hədis və rəvayətlərə diqqətin lüzumu**

:Elmi hövzə ustadlarından biri Ayətullah Mö`mininin dilindən belə nəql edir

Təhsil aldığım illərdə həmişə tələbə yoldaşlarımdan biri ilə dərslərimi oxuyardım. Bir gün həmin tələbə yoldaşım dərs oxumaq üçün mənim otağıma gələndə dedi: Doğrusunu bilmək istəsən, daha hövzədə qalmaq istəmirəm. Artıq bu mühitdən bezmişəm. Gedib başqa bir işlə məşğul olmaq istəyirəm. Burada qalmağın insana heç bir faydası yoxdur. Mən ona dedim: Axı hara getmək istəyirsən və nə iş görəcəksən? Dedi: Müəllimlik



---

Kəramate mə`nəvi”, Seyyid Abbas Musəvi Mutləq, səh. ٥٥-٥٧“ [٦٠] -١

və ya başqa bir işlə məşğul olaram. Bu söz bizim öz aramızda qaldı. Üstündən bir-neçə gün keçəndən sonra həmin tələbə yoldaşımla birlikdə Behcətin mənzilinə getdik. Əyləşən kimi Behcət buyurdu: “Ay bala bu “Qalə Sadiq” və “Qalə Baqir”ləri yüngül (əhəmiyyətsiz) saymayın. Elə fikirləşməyin ki, müəllim olmaqla nə isə əldə edəcəksiniz. ”.Heç də bu cür deyil, hər nə varsa buradadır

Behcətin bu sözləri mənim dostum üçün əməlli-başlı tənbeh oldu və səhvini başa .düşüb öz yanlış fikirlərindən daşındı

### Qeyb aləminin şühudu

Böyük övliyalardan biri belə buyurur: Biz əvvəllər cümə günləri Ağa Behcətin mənzilinə gedərdik. Behcət həmişə bu cümləni təkrar edərdi: “Ey eyibləri örtən!” Onun təkrarladığı bu zikrin böyük mə`nası vardı. Yə`ni, Behcət başqalarının bə`zi əməllərini gördüyü və bildiyi üçün Allah-təaladan bu eyibləri bir sirr olaraq saxlamağa kömək .istəyir. Ona görə də bu zikri çox təkrarlayardı

Bu barədə Misbah Yəzdi belə buyurur: “Mənim nəzərimcə Behcət irfan və mə`nəvi kamal məqamının elə yüksək bir həddinə çatmışdır ki, qeyb aləmindən bə`zi şeyləri müşahidə edirdi. O çox vaxt bə`zi şəxslərin batinini görür, amma bunları bilmək (istəmədiyi üçün bu zikr onun dilinin əzbərinə çevrilmişdir.”(١

Əlbəttə elə şəxslərin camaatın sirlərindən xəbərdar olmasının Allah-təalanın “səttar” sifətilə heç bir ziddiyyəti yoxdur. İnsan fəna məqamına çatmayınca bu xüsusiyyət hasil olmaz. Həmin məqamda Allahın zatından başqa kimsə olmur. Allah-təala buyurur: “Bəndəmin görən gözü və eşidən qulağı Mən özüm olaram.” Digər tərəfdən bə’zi ilahi şəxsiyyətlər elə bir məqama çatırlar ki, başqalarının sirlərini faş etmək onların şə`ninə .yaraşmayan bir əməldir



---

Dər məhzəre büzürqan”, Möhsün Qərəviyan, ٢-ci cild, səh. ٧٥“ [٦١] -١

Onlar əgər kiminsə sirini bilsələr belə, Allah dərgahının əmanətdarı olduqları üçün heç .vaxt bunu faş etməzlər

**...Biz elə bir zikr bilirik ki**

Bir dəfə ilahi şəxsiyyətlərdən biri “Müqəddəs ziyarətgahlar”ın ziyarətindən məhrum olduğumuz barədə söhbət edərək dedi: “Biz gör nə qədər məhrum olmuşuq ki, mə`sum imamları ziyarət etmək belə bizə nəsib olmur. Bütün bunlar bizim öz ”.əməllərimizin nəticəsidir

İran-İraq müharibəsi zamanı bir qrup alim Behcətin hüzuruna gedib dedilər: Ağa, siz Səddamın dövlətinin süqut etməsi üçün bir dua edin.” Behcət buyurdu: “Bizim elə zikr və virdlərimiz var ki, əgər onları oxusaq, Səddama möhlət belə verilmədən məhv olar. Amma İmam Zaman (ə) bunu hələ məsləhət bilmir və hələlik Allah onun məhv olmasını ”.iradə etməyibdir

**İlahi töhfə**

Seyyid Hüseyn Təqəvi belə nəql edir: Fumən şəhərinə gedib bir gün orada qaldım. Quma qayıtmaq istərkən, Fumən alimlərindən olan Seyyid Əbülqasim Ərib Fuməninin hüzuruna getdim. Seyyid Ərib mənə bir-neçə sikkə verib dedi: “Bunlardan birini Behcətə verərsiniz.” Quma gələn kimi Ayətullah Behcətin yanına gedib sikkələri (pul) ona verdim. Yenə də Fumənə getmək istədiyimi bilən Ayətullah Behcət mənə min tümən verib buyurdu: Bu pulu bir nəfərin vasitəsilə Seyyid Əribə çatdır.” Mən pulu dükan sahiblərindən birinə verib dedim: Bu pulu Seyyid Əribə verin və kimin göndərdiyini ona deməyin. Həmin şəxsin dükanında oturub onun qayıtmasını gözlədim. Dükançının qayıdarkən çox təəccübləndiyini görəndə soruşdum: Nə olub. O dedi: Mən bu pulu ona verəndə buyurdu: “Evimin bir tərəfi uçulub tökülmüşdü. Usta evi yenidən tə`mir etmək üçün min tümən pul istədi. Amma mənim pulum olmadığına görə ustadan bir

az gözləməsini xahiş etdim. İndi sənin gətirdiyin bu pul evimin tə`miri üçün ehtiyacım (olan məbləğ qədərdir.(١

Bəli, bu cür hadisələr və ya əhvalatlar təsadüfi deyil. Allah övliyaları ilahi sirlərə .agahdırlar. Onların həyat tərzi başdan-başa sirlərlə doludur

## Hər sözə tez inanma

Qumun əxlaq ustadlarından biri öz dərslərinin birində buyurdu: Bir gün bir-neçə nəfərlə xüsusi bir mövzu ətrafında söhbət edirdik. Söhbət əsnasında gətirdikləri dəlillərə görə demək olar ki, mən onların bu sözü ilə razılaşdım. Bu söhbətdən sonra yolda Behcətlə rastlaşdım. Məni görən kimi dedi: "Demək, indi də uşaqlar sənin üçün nüsxə yazırlar." Mən Behcətin nə dediyini dərhal başa düşdüm. O, bu qısa sözü ilə çox şeyi mənə başa saldı. Behcət mənimlə dostlarım arasında olan söhbətdən agah .olduğuna görə bizi, belə yersiz tə`sirlənməkdən xilas etdi

## Yuxuda sənə demişəm

Bir nəfər bə`zi etiqad məsələlərində şəkk-şübhəyə düşdüyünə görə çox əziyyət çəkir və suallarına doğru-düzgün cavab tapa bilmirdi. O, Qum şəhərinə gəlib orada sakin olur. Bir dəfə gecə Behcəti yuxuda görür. Yuxuda Behcət onun bütün şəkk-şübhələrinə tutarlı cavab verir. Həmin şəxs yuxudan ayılan zaman bu yuxunun sadiq olub-olmaması fikri onun qəlbində qəribə nigarançılıq yaradır. O, bu suallarana cavab almaq üçün cümə günü Behcətin hüzuruna gedir. Bu şəxs hələ bir söz deməmiş (Behcət buyurur: "Suallarının cavabını sənə yuxuda demişdim, daha şəkk etmə."(٢



---

.Bərgi əz dəftəre aftab", Rza Baqirzadə, səh. ٥٨-٥٩, müxtəsər dəyişikliklə" [٦٢] -١

Besuye məhbub", Seyyid Mehdi Sai, səh. ١۴" [٦٣] -٢

### Dilə nəzarət üçün tapşırıq

Behcətin dostlarından biri belə nəql edir: Bir dəfə dilimi qorumağı qəlbimdə niyyət etmişdim. Təsadüfən, həmin gün Behcətin hüzuruna getmişdim. O, mənə dedi: “İnsanın öz dilinə yiyə durması çox yaxşı bir işdir. Əgər məsləhət olsaydı və insan bacara bilsəydi, yalnız Qur`an ayələri ilə söhbət edərdi.”

### Övladlara bərabər sevgi

Ayətullah Behcətin dərslərində iştirak edən ruhanilərdən biri belə deyir: Mənim iki qız övladım var idi. Bir dəfə axşam kiçik qızımı nəvaziş edib öpdüm və böyük qızımı, sanki unutdum. Bir anlıq ürəyimdə fikirləşdim ki, birdən böyük qız oyaq olar və onu nəvaziş etmədiyimə görə məndən inciyər. Buna baxmayaraq daha fikir vermədim. Səhər tezdən Behcətin hüzuruna getdim. Salam verəndən sonra dərhal mənə dedi: “İnşallah, övladlar arasındakı bərabərliyə riayət edirsiniz.”

### Allah övliyasının kəraməti

Höccətül-islam Şüştəri buyurur ki, dostlarımdan biri mənim üçün belə nəql edirdi: Bir müddət olardı ki, gecə namazı qılmaq istəyirdim. Amma həmin vaxt yuxuya gedir və ayıla bilmirdim. Bir gün Ayətullah Behcətə dedim: Ağa, bir müddətdir ki, gecə namazı qılmaq istəyirəm. Amma həmin vaxt yuxudan dura bilmirəm. Behcət buyurdu: “Saat neçədə yuxudan durmaq istəyirsən?” Dedim: Gecə saat üçdə. Mənə dedi ki, get inşallah oyanarsan. Ayətullah Behcətin bu sözündən sonra hər axşam saat üçdə, hətta çox yorğun olsam belə yuxudan oyanıram.(١)



---

١- [۶۴] “Kəramate mə`nəvi”, Seyyid Abbas Musəvi

## İnşallah, daha yanmaz

Höccətül-islam Ağa Seyyid nəql edir: Bir gün cavan bir oğlan mənim qızıma elçiliyə gəlmişdi. Dini baxımdan nəzər və fikirlərimiz uyğun gəlmədiyinə görə bu cavana yox cavabı verdik. Bu sözdən sonra oğlan evi sehr və caduya əl atdılar. Elə bir vəziyyətə düşdük ki, hər dəfə evin bir küncündən alov qalxırdı. Artıq, nə edəcəyimizi bilmirdik. Ayətullah Behcətin hüzuruna gedib başımıza gələnləri ona danışdım. Ayətullah Behcət buyurdu: "İnşallah, daha evinizdə alov görməzsiniz." Ayətullah Behcətin bu sözündən .sonra həmin müsibətdən yaxa qurtardıq

## Cənab, özünütərbiyə bu cür olmaz

İsfahanlı tələbələrdən biri belə deyir: Mən nəfsimi islah etmək niyyətilə bir-neçə aylığa Məşhədə yollandım. Orada olarkən bir gün Ayətullah Behcətin hüzuruna getdim. O, məndən heç bir şey soruşmadan dedi: "Ay bala, nəfsi bu cür islah etməyin heç bir faydası yoxdur. Ananı razı salmaq üçün İsfahana getsən yaxşıdır." Amma mən Behcətin bu sözü ilə razılaşmayıb, onunla mübahisə etməyə başladım. Behcətlə xudahafizləşib qayıdanda, birdən fikirləşdim ki, axı bu haqda qabaqcadan mən ona .heç bir şey deməmişdim. Elə buna görə də geri qayıdıb Behcətdən üzr istədim

## Qurtuluş düz danışmaqdadır

Höccətül-islam Şabani belə nəql edir: Ruhani libası geymək iftixarına nail olduğum vaxt Ayətullah Behcətin hüzuruna getməyi qərara aldım. Həmin gün sübh namazından sonra əmmamənin Behcətin əliylə başıma qoyulması üçün onun namaz qıldığı məscidə getdim. Ayətullah Behcət əmmaməni başıma qoyandan sonra məndən soruşdu: "İndi hansı dərsi oxuyursunuz?" Həmin vaxtlar demək olar ki, "Lümə" kitabını qurtarmışdım. Amma fiqhə aid neçə şö`bə hələ qalmışdı. Behcət məndən bu haqda soruşanda həmin hissələri oxumadığım fikrimdə belə deyildi. Ona görə də dedim ki, "Lüməteyni" qurtarmışam. Bir anlıq Behcətin

üzündəki qəzəbi hiss etdim. Mənə dedi: “İnsan ancaq doğru danışmaqla nicat tapar.” Ayətullah Behcət hamıya dua etdi və mənə isə bu sözü dedi. Bu barədə çox götür-qoy edəndən sonra yadıma düşdü ki, axı mən hələ bir neçə kitabı oxumadığım halda “Lüməteyni qurtarmışam” deməyim düzgün deyildi. Buna görə də Behcətin hüzuruna gedib ərz etdim: Mənim “Lüməteyni” qurtarmışam deməkdə məqsədim, ümumilikdə bitirdiyimi nəzərdə tutmuşdum. Amma bu bəhsə aid hələ bir neçə kiçik kitabları .oxumadığım fikrimdən çıxmışdı

Bu sözləri eşidəndən sonra Behcətin üzündə razılıq hissi yarandı. O mənim üçün dua etdi. Bu əhvalatdan sonra Behcətin adamların batini sirlərindən xəbərdar olması mənə .açıq-aşkar sübut oldu

**Tez getməyiniz məsləhətdir**

Böyük şəxsiyyətlərdən biri deyir: Mən həmişə Ayətullah Behcətin camaat namazında iştirak etməyə çalışırdım. Həmin vaxtlar mənim evim Qumun Yəzdanşəhr deyilən .məhəlləsində yerləşirdi. Bu məhəllə təzə salındığına görə burada çox az ev var idi

Mən gündüzlər dərsə gedər və axşam namazını Behcətlə qılandan sonra evə qayıdardım. Bir axşam yenə Şam namazını qılandan sonra məsciddən çıxanda mən də onun arxasınca getdim. Elə bu vaxt Behcət məndən soruşdu: “Sənin evin haradadır?” Dedim: Filan məhəllədə. O, bir az fikirləşəndən sonra dedi: “Siz tez evə gedin və ”.axşamlar camaat namazı üçün məscidə gəlməyiniz də lazım deyil

Onun heç vaxt yersiz söz demədiyini bildiyim üçün tez özümü evə çatdırdım. Evə gələndə həyat yoldaşımın uşağı qucaqlayıb evin dalanında oturduğunu gördüm. Niyə burada oturmasının səbəbini soruşanda, dedi: Evdə əqrəb var. Həmin

gecədən sonra uzun müddət Behcətin camaat namazına getmədim və ailəmdən tez-tez xəbər tutmaq üçün öz məhəlləmizdəki məsciddə namaz qılardım.

### İstixarə

Ayətullah Behcətin şagirdlərindən olan Ləngərud elmi hövzəsinin məs`ul işçisi Höccətül-islam Abbasi buyurur: Bir gün dostumla birgə məscidin yuxarı təbəqəsində oturmuşduq. Mən bir iş üçün istixarə etdirmək istəyirdim. Amma Behcətin yanına gedib bu sözü (istixarə etməyi) deməyə utanırdım. Dostumdan mənim üçün istixarə etməsini xahiş etdim. Behcət məsciddə divarın kənarında oturmuş və bir dəstə adam istixarə etmək üçün onun ətrafına toplaşmışdılar. Növbə mənim dostuma çatanda Behcət istixarə edəndən sonra işarə ilə nə isə dedi. Amma istixarənin ətraflı cavabını mənim özümə izah etdi.(١)

### Fikri oxumaq

Höccəti nəql edir ki, bir gün dostumla bərabər Ayətullah Behcətin "üsul" dərsində iştirak etdik. Behcət dərsdə "inşa" və "əxbar" haqqında söhbət edirdi. O zamanlar mən hələ evlənməmişdim. Birdən ağlıma belə bir fikir gəldi ki, namaz halında Allah-təaladan saleh həyat yoldaşı istəmək üçün dua etmək olarmı? Behcət elə həmin dəqiqə dedi: "Bəli insan namaz halında bu cür dua edə bilər".

Dərs bitdikdən sonra evli dostlarımdan biri mənə dedi: "Dərsdə söhbət "inşa" və "əxbar"dan gedəndə övladım olmasını arzuladığım üçün fikrimdə–namaz halında Allah-təaladan övlad payı istəmək olarmı?– sualı yarandı. Elə bu vaxt Behcət həmin mətləbə cavab verdi. Onun bizim hər ikimizin fikrindən xəbərdar olmasını başa düşdük.(٢)



---

١- [٦٥] Höccətülislam Kəraminijadla söhbətdən.

٢- [٦٦] Həmin mənbə.

Seyyid bir şəxs belə deyirdi: Bir gün həmişəki adətim üzrə yenə şam namazından sonra Behcətlə birlikdə onun mənzilinin qapısına qədər getdim. Yolda gedərkən birdən ağlıma gəldi ki, Behcətdən bizim şəcərənaməmizin düzgün olub-olmaması barədə soruşum. Öz-özümə fikirləşdim ki, görən o şəcərənamə haqqında nəsə bilirmi? Behcətin mənzilinin qapısına çatanda tələbələr bir-bir onun əlini öpüb getdilər. Növbə mənə çatanda, o heç bir şey soruşmadan dedi: “Əgər şəcərənamə haqqında bir şey bilmək istəyirsənsə, filankəsin yanına get”.

səh:٩٠

## (BEŞİNCİ FƏSİL: Əməli tapşırıqlar (tövsiyyələr və moizələr

### .Günahı tərk etmək axar çeşməyə bənzər

Hörmətli tələbələrdən biri belə nəql edir: Bir gün Ayətullah Behcətin hüzuruna gedib dedim: Rəhmətlik Bidabadi kimi tanınmış dini şəxsiyyətlərdən nəql olunmuş xüsusi tapşırıqlara ustadın göstərişi olmadan biz özümüz əməl edə bilərikmi? Behcət belə cavab verdi: “Rəhmətlik Bidabadi və digər böyük şəxsiyyətlər islam yolunda çox zəhmət çəkmişlər. Bu şəxsiyyətlərin hər biri mö`min insanları müxtəlif yollarla Allaha tərəf gedən yola hidayət edərmişlər. Amma mənim nəzərimcə bütün xüsusi tapşırıqlar bir şeydə–günahı tərk etməkdə toplanmışdır. Elə fikirləşməyin ki, günah etməmək özü çox asan və sadə bir işdir. Bə`zən zahirdə sadə görünən bu işin özü çox çətindir. Günahları tərk etmək axar çeşməyə bənzəyir. Əvvəlcə siz günahları tərk edin, sonrakı ”.ibadət və tapşırıqlar özü sizə tərəf gələcək

Çox dindar tələbələrdən biri deyir ki, bir gün Ayətullah Behcətin yanına gedib dedim: Mənə xüsusi bir tapşırıq verin. Buyurdu: “Çalış günah etmə.” Dedim: Bu yaşda mənə günah etmək yaraşarmı? Bir zikr və ya xüsusi tapşırıq verin ki, ona əməl edim. Behcət dedi: “Dünən öz evində hansı günaha mürtəkib olduğunu deyimmi?” Mən dedim: Bəli, deyin. Behcət dünən baş verənləri bir-bir mənə sadalayanda, yerimdə quruyub qaldım. Sonra tez onunla sağollaşıb getdim. (Əlbəttə, hər kəs öz həddində günaha (.mürtəkib olur və ola bilsin ki, bə`zilərinin nəzərində bunlar günah hesab olmasın

İnqilabda çox zəhmət çəkmiş böyük şəxsiyyətlərindən biri Behcətdən xüsusi bir tapşırıq istədi. Behcət həmişəki kimi başını aşağı salıb zikr deməyə məşğul idi. O, başını qaldırıb dedi: “Bacardıqca günah

etməyin.” Sonra yenə də zikr deməyə davam etdi. Yenə mənə baxıb buyurdu: Əgər birdən hər hansı bir günaha mürtəkib olsanız, çalışın camaatın haqqı ilə əlaqədar olmasın.” Sonra yenə zikr deməyə məşğul oldu. Üçüncü dəfə başını qaldırıb dedi: “Əgər həqqünnasla əlaqədar günaha mürtəkib olsanız, bu dünyada halallıq almağa çalışın.” (.(Bu günahı axirətə saxlamayın, orada sizin üçün çox çətin olar

**.Tapşırılana əməl etmək lazımdır**

Bir tələbə deyir: “Ayətullah Behcətə dedim: Peyğəmbər (s) və Həzrət Əlinin (ə) Salman Farsi, Əbuzər, Meysəm Təmmar və Rəşid Hicri kimi şəxsiyyətlərə verdikləri xüsusi tapşırıqlar hal-hazırda mövcuddurmu? Behcət buyurdu: “Hər nə varsa Qur`an və ”.Nəhcül bəlağədədir. Bunlardan başqa heç bir şey öz səhabələrinə öyrətməyiblər

Başqa bir yerdə belə buyurmuşdur: “Tapşırıq istəyənlərin sayı çoxdur. Amma mən hər kəsə bir tapşırıq verə bilmərəm. Bu tapşırığı mən hamıya tövsiyə edirdim ki, “Vəsailüş-şiə” kitabının “Cihadun-nəfs” bölümündən hər gün bir hədis oxuyub, ona əməl etməyə çalışsınlar. Bir ildən sonra əxlaqi cəhətdən dəyişdiyinizi hiss edəcəksiniz. Bu, xəstələndiyiniz vaxt istifadə etdiyiniz dərmana bənzəyir. Çünki dərmanın tə`siri bir ”.müddət keçəndən sonra özünü büruzə verir

Dər məhzəre bozorgan” kitabında Ustad Qərəviyan belə qeyd etmişdir: “Bir gün bir“ qrup adamla Ayətullah Behcətin hüzurunda (məclisində) oturmuşduq. O, üzünü məclisdəkilərə tutub dedi: Hüzeyfədən nəql olunur ki, İmam Sadiq (ə)-ın yanına gəlib ərz etdi: Ey peyğəmbər övladı! Hamı sizdən “xeyir nədir?”–sualını soruşur. Amma mən .sizdən “şər nədir?”–sualını soruşmaq istəyirəm

Sonra Behcət əlavə edərək dedi: İnsan əgər şərin nə olduğunu bilsə və ona mürtəkib ”.olmasa, bütün işləri düzələr

### Riyanın əlacı

Bir dəfə Ayətullah Behcət söhbətini bitirdikdən sonra icazə alıb dedim: Mənim bir... sualım var. Buyurdu: “Əgər xülasə olsa, eybi yoxdur.” Ərz elədim: Bə`zən, insan Allah yolunda gördüyü xeyir işlərin tam ixlasla olması üçün çox sə`y edir. Amma şöhrətpərəstlik, camaatın yanında riyakarlıq, başqaları tərəfdən tə`riflənmək kimi cüzi şeytani vəsvəsələrdən yaxa qurtara bilmir. İnsanın zehnində dolaşan belə ?vəsvəsələr riya sayılırmı? Bu fikirlər insanın gördüyü xeyir işlərin dəyərini azaldırmı

Behcət belə cavab verdi: “Yol verilməyən riya ancaq ibadətdir və riya ilə qarışıq olan ibadi əməllər haramdır. Bə`zilərinin dediyinə görə riya hətta ibadəti batil edir. Amma ibadətdən kənar işlərdə riyanın maneəsi (eybi) yoxdur. Riyanın özü riyaya çarə ola .bilər və riyanın çarəsi də düzgün fikirləşməkdədir

### Niyyət

Belə niyyət edin ki, elminizlə əməliniz uyğun olsun. Elm və əməl nə biri-birindən qabağa keçsin və nə də geri qalsınlar. Bizim bədbəxtçiliyimizin əsas səbəbi elm və əməlimizin uyğun olmamasıdır. Bə`zilərinin elmi əməlindən geridə, bə`zilərinki isə irəlidədir. Xülasə, elmləri ilə əməlləri biri-birinə uyğun gəlmir. Adətən, bir çoxlarının elmi bə`zən əməlindən qabağa keçir və bə`zən də geri qalır. Beləliklə, bildiyiniz hər bir (şeyə əməl etməyə çalışın ki, elminizlə əməliniz bərabər olsun.(١

### Nur çeşməsindən süzülən kəlamlar

Kommunistlərin Qafzaqdakı represiyaları

Kommunistlərin hökumət etdikləri yetmiş illik represiya dövründə Qafqazda–Bakı, İrəvan, Naxçıvan və digər şəhərlərdə din və dindarların başına



---

Dər məhzəre büzürqan”, Möhsün Qərəviyan, səh. ٧١-٧٢“ [۶٧] -١

nələr gəldiyini bir Allah bilir. Camatın din adını çəkməyə ixtiyarı yox idi. Onların hökumət etdikləri dövrlərdə uzun illər camaat namazı qılınan məscidlər anbarlara çevrildi. Qafqazın böyük alimlərindən olan Mirzə Qəni Badkubini çox faciəli bir şəkildə öldürdülər. Bolşeviklərin Qafqaza gəldiyi ilk vaxtlarda Leninin şəklini küçə və ".bazarlarda gəzdirib deyirdilər: "Lenin Məhəmməddən (s) ağıllıdır

Mirzə Qəni minbərə çıxıb dedi: "Düzdür ki, Lenin ağıllı adamdır, amma həzrət Məhəmmədin (s) ayaqqabısının bağı belə ola bilməz. Bu sözə görə kommunistlər ona .əzab verərək öldürdülər. Onun qatilinə Allah lə`nət eləsin

Bakıda elə ağır vəziyyət yaranmışdı ki, alimlər ya təqiyyə, ya da hicrət etməyə məcbur (oldular.(١

**Günah və günahkarın aqibəti**

İmam Rzadan (ə) belə rəvayət olunmuşdur: "Allahın rəğbət və mərhəmətindən naümid olmaq, insanın ömür boyu mürtəkib olduğu günahlarından qat-qat çoxdur." Əgər Allaha qarşı mə`siyət (üsyan) etməkdə öz nəfsimizin öhdəsindən gələ bilməsək, getdikcə ilahi ayələri təkzib və inkar etməyə başlayacağıq. Beləliklə, Allahın rəhmət və mərhəmətindən naümid olacağıq, halbuki, günahkar olan hər bir şəxsə Allahın .rəhmətindən uzaq olması gün kimi aydındır

Qiyamət günü Allah-təala rəhmət qapılarını elə açacaqdır ki, hətta İblis də tamah" (salacaq." (٢

İmam Hüseynin (ə) şəhadəti müqabilində Ömər Sə`də hansı və`dlər verilməmişdi? (Amma o nə şah, nə xəlifə və nə də Reyin hakimi ola bildi.(٣



---

"Dər məhzəre Ayətullah-Üzma Behcət" [۶٨]-١

Biharül-ənvar", c. ٧, səh. ٢٨٧; c. ۶, səh. ٢٣۶. "Əmali", Şeyx Səduq, səh. ٢٠۵." [۶٩] -٢ "Rövzətül-vaizin", c. ٢, səh. ۵٠٢

Rey, onun ətrafı və Cürcan vilayətlərinə hakimlik etməyi Ömər Sə`də və`d" [٧٠] -٣ vermişdilər." "Biharül-ənvar", c. ۴۴, səh. ٣٠۵ və ٣٨۵; c. ۴۵, səh. ٩. "Kəşfül-qummə", c. ٢,

Nəfsin bu vəsvəsələrindən Allaha pənah aparırıq. İnsan öz aqibətinin xeyirli olması (üçün nəfsini hər cür vəsvəsələrdən qorumalıdır.(١)

### ...Məkruh yemək yemişdim

Nəcəf elmi hövzəsindəki təhsilini başa vurmuş bir tələbə İrana qayıtmaq istəyərkən, Seyyid Məhəmməd Kazim Yəzdinin yanına gedib, ona rəvayət nəql etməsi üçün icazə verməsini istəyir. Bir-neçə gün keçsə də, Seyyid Yəzdi bir cavab vermir. Həmin tələbə deyir: Öz-özümə fikirləşirdim ki, Seyyiddən Beytül-maldan bir şey istəməmişəm! Mənə elə gəlir ki, İranda onu elə də tanıyan olmaz və onun icazə verməsi bir o qədər də mühüm deyil. Elə buna görə də hər dəfə Seyyid Məhəmməd Kazim Yəzdini görəndə .çox acığım tuturdu

Bu əhvalatdan bir-neçə gün keçəndən sonra Seyyid rəvayət nəql etməyi mənə icazə verdi və cavabı gecikdirdiyi üçün məndən üzrxahlıq etdi. O, tə`xirə salınmış cavabın :səbəbini belə açıqladı

Mən o gün məkruh yemək yemişdim. Onun tə`sirinin bütünlüklə bədənimdən" çıxmasını gözlədim ki, tam paklanandan sonra silsilə rəvayətlər sırasında böyük alim və ravilərlə öz mə`nəvi bağlılığımı bərpa edim və bundan sonra sənə rəvayət nəql (etmək icazəsi verim."(٢)

### Halal və haram yeməyin insanın taleyindəki rolu

Vay o gündən ki, yemək-içməkdə haramdan çəkinməyək. Çünki bu yeməklər insanın elm, iman və ya küfründə böyük tə`siri var. Elə bu cəhətdən də bir vaxt ayılıb görürük ki, Yezidə iman gətirmişik. Allah-təala "Bəqərə" surəsinin ٣٥-ci ayəsində Adəmə (ə) :belə buyurur



---

Həmin mənbə, səh. ١٩٣ [٧١]-١

Həmin mənbə, səh. ٣٣٧ [٧٢]-٢

”.Sizə haram buyurulmuş bu ağaca yaxınlaşmayın ki, zülmkarlardan olmayasınız“

Bu ayədən mə`lum olur ki, elə bu yemək-içməklər Adəmin (ə) cənnətdən qovulub yer üzünə gəlməsinin səbəblərindəndir. Yemək-içmək insanı məxluqatın ən ali ya da ən alçaq (aşağı) dərəcəsinə çatdıra bilər. Bütün yeməli-içməlilər insanın qanında, bədənində, ruhunda, zehnində və fikrində özünü çox aydın büruzə verir. Elm, əməldə yüksək müvəffəqiyyətlər əldə etmiş sağlam fikir və düşüncə sahibi olan alimlər, ancaq (halal yeməklərdən istifadə etməklə belə ali məqamlara çata bilmişlər.(١)

**!Bu vəhşilərə deyin**

Böyük alimlərdən biri bolşeviklərin zamanında Rusiyada olan bir şəxsin dilindən belə :nəql edirdi

Qafqazda yerləşən üç böyük şəhərə – Bakı, Tiflis və İrəvana get-gəl edirdim. Bir dəfə“ Tiflis şəhərində olarkən bir qrup məsihi ilə qatara mindim. Elə bu vaxt bir keşiş də onu müşaiyət edən bir-neçə nəfərlə qatara daxil oldu. O vaxtlar hər şəhərdə ancaq iki və ya üç keşiş olardı. Buna baxmayaraq qatarda olan məsihilərin heç biri ona əhəmiyyət :vermədi. Elə bu vaxt qalxıb yerimi həmin keşişə verdim. Keşiş dedi

Nə üçün qalxıb yerini mənə verdin? Dedim: Çünki bizim itaət etdiyimiz peyğəmbər bizə .ruhanilərə hörmət etməyi buyurmuşdur

Keşiş bir müddət başını aşağı saldı və sonra yenə də soruşdu: Xahiş edirəm, niyə qalxıb mənə yer verdiyinizi bir daha təkrar edəsiniz. Dedim ki, biz müsəlmanların peyğəmbəri ruhanilərə hörmət etməyi bizə tövsiyə etmişdir. Keşiş ətrafına göz (.gəzdirib dedi: “Bunu bu vəhşilərə deyin, bu vəhşilərə deyin! (Bolşevik–yə`ni dinsiz



---

Həmin mənbə, səh. ٣٣٧-٣٣٨ [٧٣] -١

(Buradan mə`lum olur ki, onlar fəqət islam dini ilə deyil, bütün dinlərlə müxalif idilər.(١)

**.Ne`mət bol deyilsə, deməli şükrümüz az olmuşdur**

Başımıza gələn bütün bəla və müsibətlər Allahın bizə əta etdiyi ne`mətlər qarşısında naşükür olmağımızla əlaqədardır. Çünki Allah-təala İbrahim surəsinin ٧-ci ayəsində :buyurur

Yadınıza salın ki, o zaman Rəbbiniz bunu bildirmişdi: Əgər (Mənə) şükür etsəniz, sizə“ olan ne`mətimi artıracağam. Yox, əgər nankorluq etsəniz, (unutmayın ki) Mənim ”.əzabım, həqiqətən, şiddətlidir

Şükür etmək ne`mətlərin artmasına və naşükürlük isə onların azalmasına səbəb olur. Əgər Allahın bizə əta etdiyi ne`mətlərin azaldığını görsək, şübhəsiz ki, bunun əsas .səbəbi bizim naşükürlüyümüzdən irəli gəlir

Şükürün geniş mə`nası vardır ki, onlardan biri də Allaha itaət deməkdir. Şükür təkcə dildə “əlhəmdülillah” deməklə bitmir. Baxmayaraq ki, bu da Allaha şükür etməyin bir .yoludur və itaət deməkdir

Deməli, Rəbbin bizə lütf etdiyi ne`mətlərin müqabilində şükür Onun itaətində olmaq və ne`mətlərin daha artması mə`nasındadır. Ne`mətlər qarşısında naşükürlük isə .Allaha qarşı üsyan və Onun tərəfindən nazil olacaq əzaba dəlalət edir

Əgər nə vaxtsa başımıza bir müsibət və ya bəla gələrsə, onun səbəbini ötən günlərdə axtarmalıyıq. Çünki, insan öz yaxşı və pis əməllərinin müqabilində Allah-təala .tərəfindən mükafatlandırılır. Yaxşıya yaxşı, pisə isə pis ilə cavab verilir

Biz nə vaxt hansı bir vacib əməli tərk etmədiyimizə və ya harama mürtəkib (olmadığımıza əmin olsaq, gərək sevincdən papağımızı göyə ataq.(٢



---

Həmin mənbə, səh. ٣٥١-٣٥٢ [٧۴] -١

Həmin mənbə, səh. ٣٥٨-٣٥٩ [٧۵] -٢

**.Halal ruzi üçün harama əl atmayaq**

:Axı, niyə bizə dərs olmur? Allah-təala Qur`anda buyurur

Ey Adəm! Həqiqətən, sən orada (cənnət) aclığın, çılpaq olmağın nə olduğunu“ (bilməzsən.”(١)

Əgər haram yeməsək aclıq və susuzluqdan ölmərik. Cənnət bütün ne`mətləri ilə sənin ixtiyarında olacaqdır. Əks-təqdirdə heç bir şey. Biz insanların əgər cənnətə inamımız olsaydı, bu qədər ilahi hökmlərə qarşı müxalif çıxmazdıq. Şeytan Adəm və Həvvaya (ə)–“(Adəmin və Həvvanın) örtülü ayıb (övrət) yerlərini özlərinə göstərmək məqsədilə onlara vəsvəsə edib dedi: Rəbbiniz sizə bu ağacı yalnız mələk olmamağınız və ya (cənnətdə) əbədi qalmamağınız üçün qadağan etmişdir.”(٢) –yalan demişdi. Allahın itaətindən çıxıb sizə nəhy edilmiş ağacın meyvəsindən yediyinizə görə, cəhənnəm !odunda yanacaqsınız

Biz insanların işi quşlara çox bənzəyir. Quşlar üçün tələ quranda ora dən tökürlər və onlar dən yemək üçün gələndə ovçunun toruna düşürlər. Əgər insanın qəlbi tora ?düşsə nə baş verər

Allahdan nə qədər uzaq düşmüşük ki, fəsad və əxlaqsızlığa düçar olmuşuq. Şiə əqidəsində müvəqqəti izdivac (siğə) caiz sayılır və haram iş (zina) görməyə heç bir ehtiyac yoxdur. Amma şeytan bir çoxlarının yolu üstə durub, onları harama sürükləyir. “İblis dedi: Sən məni (Adəmə səcdə etmədiyimə görə) məhrum etdiyinə əvəz olaraq mən də Sənin düz yolunun üstündə oturub insanlara (Sənə ibadət və itaət etməyə) !mane olacağam

Allah-təala buyurdu: Oradan (cənnət) rüsvay olmuş (qovulmuş) halda çıx. Onlardan (insanlar) hər kim sənə uysa, (cəzasını alacaq). Əlbəttə, cəhənnəmi sizin hamınızla ”!dolduracağam



---

.Taha”, ayə ١١٨“ [٧۶]-١

.Ə`raf”, ayə ٢٠“ [٧٧]-٢

Bizim bir əzəmətimiz yoxdur. Olanı da bu qədərdir ki, ayaq üstə durub qiyam halını .۲ alırıq. Sonra həmin əzəmətimizi rükuya getməklə yarıya bölürük. (Bir az da kiçildirik) .(Daha sonra isə səcdəyə və torpağa dönürük. (Tamamilə heç oluruq

Namazda qiyam [halını almaq] iki dostun söhbətinə bənzəyir. Hərçənd söhbət bir .۳ şeydən gedir. Amma rüku ağa və nökərin məsələsinə oxşayır. Ona görə də rükuda “Sübhanə rəbbiəl-əzim...” zikri deyilməlidir. Bununla belə səcdəyə nisbətdə [rükuda deyilən bu zikr Allah qarşısında kiçilməkdə] ən aşağı mərtəbə sayılır. Başqa sözlə desək, bəndənin namazda qiyamı übudiyyətin (bəndəliyin) və sükunun (xatircəmliyin) izharıdır. Yə`ni bəndənin özündən heç bir hərəkəti yoxdur. [Amma] səcdə xüzu`nun .(Allaha bəndəliyin, təslimin) son həddidir

Bəndə Həzrət Haqqın müqəddəs hüzurundan qayıtdıqda (namazı bitirdiyində) Allah .۴ tərəfindən gətirdiyi ilk sovqat salamdır. Kufə məscidinin duasında deyilir: “Sən Özün salamsan! Salam sənin tərəfindəndir və Sənə tərəf də qayıdır. İlahi! Bizi Öz tərəfindən (olan salamla salamla.(۱

Namaza giriş üçün deyilən təkbirin və namazdan xaric olmaq üçün [deyilən] təslimin .۵ [bu əməllərlə] nə qədər tənasübü var? Baxmayaraq ki, “kəbir” və



---

Bihar”, c. ۱۰۰, səh. ۴۱۲; c. ۹۱, səh. ۲۱۸“ [۷۸] -۱

əzim” hər ikisi Allahın adlarıdır, amma təkbirdə “əkbər” münasibdir. Çünki, onda“ maneçilik nəzərdə tutulmuşdur. Yə`ni [təkbir deyib əlləri yuxarı qaldırmaqla] bütün dünya işlərini və bütün böyükləri (böyük saydıqlarınızı) bir kənara qoyun. Çünki Allah-təala Əkbərdir. Yeri gəlmişkən, “həyyə əla xəyril-əməl” kəlamı da həmin nöqtənin .daşıyıcısıdır

Hər halda, namaz qılan təkbir deməklə ilahi hərəmə daxil olur. Amma biz nə bilirik ?bunlar nə deməkdir

Rəvayətdə deyilir: “Əgər namaz qılan nə kimi ilahi cəlalla əhatə olunduğunu bilsəydi, (heç vaxt namazdan üz döndərməzdi.”(١)

Qiyam -başdan-ayağa xidmət və bəndəlik üçün hazıram deməkdir. Eynən . ۶ hərəkətsiz dayanan çubuq kimi və ya heç bir iradəsi olmayan budaq kimi ki, külək hansı səmtə əssə, həmin tərəfə hərəkət edir. Qiyamda, rükuda və səcdədə olan xatircəmlik rükunun özünün qüvvətləndiricisidir. Həmçinin, zikrdə xatircəmlik də onun .kimidir

Namaz halında Allahı zikr etmək ən yaxşı zikrdir. Çünki namaz Kə`bə evi kimidir; .٧ namaz qılan sanki Kə`bəyə - Allahın əmin hərəminə daxil olur. [Namaz qılanın] niyyəti .bu olur ki, “təkbir” qapısından girib “təslim” qapısından çıxsın

**Rüşvətxorluğun mənfi tə`sirləri**

Müsəlman torpaqlarını ələ keçirmək üçün kafirlərin həmişə əsaslı planları olmuşdur. O cümlədən də kafirlər müsəlmanları həmişəlik öz qullarına çevirib, onlara ağalıq etmək ?istəyiblər. Onların bu şərindən xilas olmaq üçün nə etməliyik

Çox gözəl bilirik ki, onların bizim üzərimizdəki hakimiyyətinin əsasını rüşvət təşkil edir. Məgər müsəlmanların öz düşmənlərindən rüşvət almamağı və bu yolla onlara məğlub (təslim) olmamağı mümkündürmü? Baxmayaraq ki, bu müsəlmanların öhdəsində olan .ixtiyari (könüllü) bir işdir

Bəli, kafirlər müsəlman (dövlətlərinin) başçılarını rüşvətlə ələ keçirirlər. Buna görə də .aldanmamaq üçün çox ayıq-sayıq olmalıyıq

Rüşvət qədər heç bir şey bizə tə`sir edib, aldada bilməz. Onlar bizim bu zəif .nöqtəmizdən istifadə edərək bizə öz müsəlmanlarımız vasitəsilə nüfuz edə bilirlər

Elə Həzrət Əli (ə)-ın işini də rüşvət ilə bitirdilər. Çünki Müaviyə Osmanın oğluna dedi: "Əgər qələbə çalsan Xorasan vilayətinə sahib olacaqsan." Beləliklə də Xorasan .vilayətini Osmanın oğluna verdi

:Osmanın oğlu dedi

?Xorasanı neyləyim–

.Sənin evinin çörəyin olsun–deyə Müaviyə cavab verdi–

Müaviyə gedərkən Osmanın oğlu şe`r oxumağa başladı. Şe`rin məzmunu belə idi ki, .nə istəyirdimsə verdi, bəlkə lap artıq da verdi

:Məclisdə olan Mərvan bunu eşidib narahat halda dedi

".Hamını alan tapılar, amma bizi alan yoxdur"

(Müaviyə ona cavab olaraq–səni də mən alacağam– dedi.(١

Yə`ni sən də bizlərdən oldun. O təkcə bu quru sözlə Mərvanı sevindirdi. Əlbəttə sonralar Müaviyə öz əqidələrinə görə bütün müsəlmanlara aid olan Fədəki Mərvana bağışladı.(٢) Bu torpaqlar Ömər ibn Əbdüləzizin vaxtına qədər Ali-Mərvanın əlində qaldı. Amma Ömər ibni Əbdüləziz hakimiyyətə gələndən sonra Fədəki Ali-Əliyə .qaytardı

Əhli-beyt (ə)-ın hədəfi yalnız Fədəki geri almaq deyildi. Bəlkə onlar bunu istəməklə .haqqı haqq sahibinə çatdırmaq istəyirdilər

.Əl-ğədir”, c. ٢, səh. ١۴٩; “Şərhi-Nəhcül-bəlağə”, İbn Əbil-Hədid, c. ٢, səh. ۶٩ və s“ [٨٠] -١

Şiə və sünni mənbələrindəki rəvayətlərə əsasən, “Fədək” Həzrət Zəhraya (ə) [٨١] -٢
.məxsus olmuş və Həzrət Peyğəmbər (s) onu qızı Fatiməyə elə sağ ikən bağışlamışdır

Rusiya-Alman müharibəsi zamanında ruslar bayram keçirmək üçün Moskva şəhərinin ətrafında böyük fasiləylə alov yandırdılar ki, alman təyyarələrinin hücumunun qarşısını .ala bilsinlər

Allah bilir ki, bu (mərasim) bayramı keçirmək üçün nə qədər pul xərcləmişdilər. Bütün bunlar kommunist ideologiyasının davamı üçün idi. Amma Allah-təala bir damla qan tökmədən kommunist məsləkini məhv etdi. Bu yalnız İlahi bir qüvvə vasitəsilə ola "!bilərdi. Baxmayaraq ki, deyirdilər: "Kommunist məsləki məğlubedilməzdir

Sual: Deyirlər ki, kommunist ideologiyası tarixi zərurətlərə bağlıdır. Ona görə də ?yenidən qayıdacaqdır. Sizcə bu belədirmi

Cavab: Məzdək məsləkində olduğu kimi kommunist ideologiyasında da deyilirdi: "Bəşəriyyətdəki bütün ixtilaflar həmişə iki şeyə görə olmuşdur: Mal və qadın." Əgər bu iki şey insanlar arasında müştərək olsa cəmiyyətdəki bütün ixtilaflar aradan gedər və ".müharibələrə son qoyular

Sizcə bu iki şeydə şərik olmaq ixtilafların sonu, yoxsa (onların) başlanğıcı deməkdir?! Sizcə həmin vaxt hamı - hər nəyim varsa başqalarıyla bölüşürəm, - yoxsa məndə olub !?başqalarında olmasın - deyəcək

".İki qardaşı bir-birinə düşmən edib onlara (hökmranlıq) ağalıq etmək istəyirlər

İslam düşmənləri müsəlman firqə və məzhəbləri arasındakı ixtilafları qənimət hesab edərək onlara ağalıq etmək niyyətindədirlər. Şiə və sünni arasına müharibə salıb hər .ikisinə qələbə çalmaq istəyirlər

Bə`ziləri açıq-aşkar din və dindarlara qarşı çıxırlar. Özümüzün və camaatın şərindən, .haqqa göz yumub tapdalamaqdan Allaha pənah aparırıq

Düşmənlərin müsəlmanlar arasında saldığı ixtilaflardan biri də bu idi ki, təqva və :zahidlikdə dillər əzbəri olan “Mamaqani”(١) haqqında deyirdilər

(Bu Əmirəlmö`590 mininə and olsun ki, o (Mamaqani) fasiqdir.”(٢“

## Duam müstəcab oldu

Gör nə günə qalmışıq ki, çətinliyə düşəndə də dua etməyə halımız olmur. Təqribən otuz-qırx il bundan əvvəl Qum şəhərində sınıqçılıqla məşğul olan bir cavan belə nəql :edirdi

Günlərin birində hicablı bir qadın işlədiyim dükana gəlib dedi: “Ayağım bərk ağrıyır.“ Deyəsən ayaq sümüyüm çıxıb, onu yerinə sala bilərsinizmi? Amma burada (yə`ni bazarda) olmaz. Çünki ağrıdan qışqıra bilərəm və naməhrəmlər mənim səsimi ”.eşitməsin deyə evə gəlsəniz yaxşı olar

Mən o qadınla razılaşdıqdan sonra dükandakı üç yüz tümən pulu da götürüb onun dalınca evlərinə getdim. Onun evinə daxil oldum və qadın qapını arxadan bağladı. :Sonra keçib öz yatağına uzandı. Mən onun topuğuna əl vurub dedim

?Ağrıyan yer buradırmı–

”.O dedi:– Yox, bir az yuxarı

”?Baldırına əl vurub soruşdum:–Bura ağrıyır

Yox, bir az da yuxarı– deyə qadın dilləndi. Onun başqa niyyətdə olduğunu başa“ .düşdüm. Qadın qəsdən məni bu iş üçün evinə çağırmışdı

O, qapını içəridən bağlamışdı və onu razı salmasaydım məni küçədəki cavanlara .döydürəcəyi ilə hədələyirdi

:Həmin qadına dedim

Üstümdə üç yüz tümən və mağazamda da iyirmi tümən var, hamısını sənə verirəm.– Amma məndən əl çək. Dediklərimin heç bir faydası olmadı. O, hey dediyi sözə israr edir .və məni hədələyirdi

Bir tərəfdən də qadın mənə o qədər yaxınlaşmışdı ki, dua və təvəssül etməyə halım qalmamışdı. Guya mənimlə dua və təvəssül arasında nəsə bir maneə və yaxud divar .var idi

Özümü zahirdə onun istəyilə razılaşmış kimi göstərməyə çalışdım. Nəsə bir bəhanə ilə .onu özümdən uzaqlaşdırıb bir şey dalınca göndərdim

Elə bu vaxt məndə dua etmək halı yarandı. Dərhal İmam Rza (ə)-a mütəvəssil olub dedim ki, əgər mənə bu bəladan qurtarmağa kömək etməsən, bu işimdən (sınıqçılıq) əl .çəkəcəyəm

Deyəsən bu cavan sınıqçılığı mö`minlərə nəsə bir kömək etmək məqsədilə İmam .Rzadan (ə) istəyibmiş və həmin iş də İmamın xüsusi diqqətində imiş

:Həmin cavan deyir

Elə bu vaxt evin damının yarıldığını və bir qoca qarının evə düşdüyünü gördüm. Başa- ”.düşdüm ki, duam qəbul olub

:Ev sahibəsi olan qadın qayıdıb gələndə həmin qoca qarını görüb soruşdu

”?Nə istəyirsən və nə üçün bura gəlmisən-

:Qarı dedi

Sizin qonşuluqda yaşayan bir qadın uşaq dünyaya gətirmişdi. Gəldim ki, bir az parça - ”.(əski) aparım

:Bəs haradan gəldin-“deyə qadın qoca qarıdan soruşanda, qarı dedi“

.Qapıdan.” Amma mən onun evin damından içəri girdiyini görmüşdüm-

Nə isə, onların başının söhbətə qarışdıqlarını görüb fürsəti əldən vermədən evin .qapısına tərəf qaçmağa başladım

:Ev sahibəsi mənim dalımca gəlib soruşdu

”?Hara gedirsən–

.Gedirəm qapını bağlayım– deyə dilləndim–

”.O dedi: “Mən qapını bağlamışam

Axı qapını necə bağlamısan ki, o qoca qarı həmin qapıdan içəri girdi– deyə cavab– verdim. Tez qapıya tərəf gedib evdən çıxmaq, o qadının əlindən xilas olmaq

istədim. Qadın mənim aradan çıxdığımı başa düşəndə, arxamca tüpürüb, söyüş .söyməyə başladı

(Həmin vaxt onun söyüşləri mənə halvadan da şirin gəlirdi.(١

**Problemlərimizin əsas səbəbi**

Kafirlərin bütün hədəfi müsəlmanlar arasına təfriqə (ixtilaf) salmaqdır: "Ayrılıq sal, ağalıq et". Millətlər və dövlətlər arasında təfriqə salıb, onları sərhədlə bir-birindən ayırmaq, hər milləti digərinin qarşısında əcnəbi kimi qələmə verməklə, kafirlərə (o cümlədən də Britaniyaya) qarşı İran və Osmanlı hərbi birliyinin yaranmasının qarşısını .aldılar

Baxmayaraq ki, Allah, Peyğəmbər (s) və pak İmamlar tərəfindən bizə çoxlu tövsiyyə olunmuşdur: "Həmişə birgə olun." Öz birliyinizi qoruyun və heç vaxt bir-birinizdən ayrılmayın. Ehtiyatlı olun ki, yadlar sizin içinizə nüfuz etməsin və kafirlərlə qarışmayın. Onlarla (kafirlərlə) əhd-peyman bağlamayın. Bunlar sizin din və dünyanızın zərərinə ".ola bilər

Amma biz bütün bu sifariş olunanları qulaq ardına vurduq və sonda arzulamadığımız .hadisələrin şahidi olduq

**?min nəfəri öldürmək olar, amma oğrunun əlini kəsmək olmaz ۱۵۰**

Xirosimada atom bombasıyla bir neçə dəqiqə ərzində ۹۰ min yaponiyalını öldürdülər, .heç uf da demədilər

Başqa ölkələri bu yolla işğal etmək istəyənlər İslam dinindəki şər`i hökmlə–oğrunun .əlini kəsməklə–müxalifdirlər. Onların nəzərincə oğrunun əlini kəsmək vəhşilikdir

Baxmayaraq ki, oğrunu cəzalandırmaqla cəmiyyətdə asayiş və əmin-amanlıq yaranır. (Onlar bunu nəzərə almırlar.(٢



---

Dər məhzəre Ayətullah Behcət", səh. ١۴٨-١۵٠" [٨۴] -١

**!Deyirəm heç günah etməyə də fikirləşməyin**

:Həzrət İsa (ə) buyurmuşdur

Qardaşım Musa (ə) buyurur: “Günah etməyin.” Amma mən sizə deyirəm ki, hətta“ ”.günah etməyi fikirləşməyin

:Musa (ə) buyurur

(Yalandan and içməyin.” Amma mən deyirəm ki, heç doğrudan da and içməyin.(١“

**Valideynə itaətdə müstəhəbbi əməllərin tərki**

?Sual: Valideynə itaət zamanı müstəhəbbi əməllərin tərki lazımdırmı

Cavab: Bəli, amma müstəhəbbilərə əməl etmək istəsən, gərək valideyninə əziyyət və zəhmət verməyəsən. Çünki, müstəhəbbi əməllərdə başqasına əziyyət etmək (haramdır.(٢

**.Mənim malım batmaz**

Şeyx İbrahim Kəlbasi ticarətlə məşğul olur və bu yolla ailəsinin xərcini tə`min edirdi. Günlərin birində ona xəbər verdilər ki, ticarət gəmiləri qərq olmuşdur. Çünki, Şeyx İbrahim Kəlbasinin də bu gəmilərdən birində çoxlu malı var idi. Şeyx bu xəbəri :gətirənlərə deyir

Mənim malım heç vaxt batmaz (qərq olmaz), çünki mən onların (malımın) xumsunu“ .vermişəm

Bir müddət keçəndən sonra xəbər çatır ki, gəmilərdə olan mallardan ancaq Şeyxin(٣) malı suda batmayıb. (Malların üstündə sahibinin adı və ünvanı qeyd olunduğuna görə (mal sahibini tapmaq bir o qədər də çətin deyildi.)(٤



---

Kafi”, c. ۵, səh. ۵۴٢; “Biharül-ənvar”, c. ١۴, səh. ٣٣١; “Əvaliul-ləali”, c. ٣, səh. ۵۴۶“ [٨۶] -١

Həmin mənbə, səh. ٢٧۴ [٨٧] -٢

۳- [۸۸] Böyük fəqih Məhəmməd İbrahim ibn Məhəmməd Həsən Kaxəki İsfahani Kəlbasi “İşaratül-üsul” kitabının müəllifi (۱۱۸۰-۱۲۶۲).

۴- [۸۹] Həmin mənbə, səh. ۲۷۵

**Elmin əhəmiyyəti**

Günlərin birində Məhəmməd ibn Müslüm İmam Sadiqin (ə) hüzurunda olarkən yuxusunu nəql edir və Əbu Hənifə onun yuxusunu tə`bir edir. İmam Sadiq (ə) ona :buyurur

(Düz dedin.(١

:Amma Əbu Hənifə gedəndən sonra İmam Sadiq (ə) Məhəmməd ibn Müslümə buyurur

".Əslində sənin gördüyün yuxunun yozumu mən dediyim kimidir“

:Məhəmməd ibn Müslüm çox təəccüblə İmamdan soruşur

"?Bəs niyə görə Əbu Hənifənin sözlərini təsdiq edərək ona–düzdür–dediniz“

İmam Sadiq (ə) buyurdu: “Təqiyyə etdim və əslində məqsədim “doğrudan da səhv ".dedin" idi

Əgər insanlar nəyi bilib-bilmədiklərindən agah olub öz nöqsanlarını düzəltməyə çalışsaydılar, din və peyğəmbərlərdən itaət etməkdə bir səviyyədə olardılar. İnsanlar arasındakı ixtilafların əsas səbəbi onların alim və cahilliklərindədir. Amma insanın qədir-qiyməti onun malı ilə deyil, elmi ilə ölçülür. Elm – bütün şeyləri və şəxsiyyətləri :özünə tərəf cəzb edir. Həmin şəxs deyir

".Məhəmməd ibn Əlidən (İmam Baqir (ə)) elmli bir şəxs görmədim

Əhli-beytlə (ə) müxalif olan şəxslər, doğrusu elm və ağılla müxalifdirlər. Həzrət Məhəmmədin (s) Əhli-beyti (ə) alim və Peyğəmbərdən (s) sonra hamıdan bilikli olduqlarına görə gərək onların buyurduqlarına əməl edək. Baxmayaraq ki, Əhli-beyt ((ə) Peyğəmbərin (s) vəsiləridir və onlara itaət etmək bizə vacibdir.(٢

səh:١٠٧

---

Kafi", c. ٨, səh. ٢٩٢; “Biharül-ənvar", c. ۴٧, səh. ٢٢٣; c. ۵٨, səh. ١۶٣“ [٩٠] -١

Həmin mənbə, səh. ٣٠۴-٣٠۵ [٩١] -٢

### Cəzasını gördüm

Seyyidlərə məhəbbət və hörmət etmək biz şiələrə xüsusi olaraq sifariş olunmuşdur. Bə`zi şəxslər deyirlər ki,–seyyidin dediyi ilə razılaşmadığımıza görə zərər-ziyana .düşmüşük

:Bundan əlavə özü də seyyid olan bir ata belə nəql edir

Bə`zən öz uşağımı tənbih və ədəb etmək məqsədilə döyürdüm. Bir az keçməmiş“ .mənim başıma nəsə bir bəla gəlirdi

İmam Həsən Əsgəri (ə) seyyidlərə hörmətsizlik və e`tinasızlıq edən bir şəxsə irad :tutanda, həmin şəxs deyir

.Mənim bu şəxsə e`tinasızlığımın səbəbi onun sizinlə müxalif olması idi

:İmam Həsən Əsgəri (ə) buyurdu

(Onun nəsli-kökü bizə çatdığına görə gərək belə etməyəydin.”(١“

### Tarix təkrarlanır

Qur`an və Əhli-beytə (ə) doğru-düzgün e`tiqadı olmadan gedilən hər-hansı bir yol sonda tənəzzülə uğrayacaqdır. Nəticədə tarix, o cümlədən də Səqifə əhvalatı və .Kərbəla vaqiəsi kimi mühüm hadisələr hər gün təkrar olur

Çünki hər gün haqq olanın haqqı tapdalanır və nahaqqa haqq qazandırılır. Həmişə Hüseyn (ə) və Yezid kimi haqq və batil də mövcuddur. Camaatın işi ya imam Hüseyn .(ə)-ın və ya Yezidin tərəfində vuruşmaqdır



---

Həmin mənbə, səh. ٣٠٥-٣٠۶ [٩٢] -١

Buna görə də insan gərək hər gün haqq və ya batil tərəfdarı olduğunu (aydınlaşdırsın.(١

**...Şah ٢٠ milyon nəfərlə oyun oynaya bilər amma mən**

Günlərin birində seyyid Cəmaləddin Əsədabadi Nəsirəddin şahın hüzurunda olarkən .əlindəki bir almanı atıb-tuturdu

:Nəsirəddin şah ona e`tiraz edib dedi

?Sən mənim hüzurumda almayla oynayırsan–

Şah iyirmi milyon nəfərin taleyi ilə oyun oynaya bilər, amma mən bir alma ilə– (oynamayım–deyə Əsədabadi dərhal cavab verdi.(٢

**.Padşahınıza ədəb verin**

Şeyx Məhəmməd Hüseyn Kaşiful-Ğita çox cəsur və qorxmaz bir adam idi. O bir gün :Rza xan Pəhləviyə (İranın şahı) dedi

Sənin səltənət və qüdrətin nə qədər yüksək olsa belə, Sultan Əbdülhəmidin səltənət"– və hakimiyyətindən üstün ola bilməz. Hal –hazırda sultan Əbdülhəmidin oğlu .Hindistanda dilənçilik edir

Bir dəfə də İraqda olarkən oranın padşahı Məlik Qazinin hüzuruna getmişdi. Məlik Qazi :ona hörmətsizlik etdiyinə görə saraydan çıxarkən saray əhlinə ucadan dedi

(Padşahınıza ədəb öyrədin, padşahınıza ədəb öyrədin!"(٣"

**...İmam Zamanla görüşməkdən daha üstün**

Bə`zən insanlar Həzrət Mehdi (ə)-ın hüzuruna nail olmaq üçün çox sə`y edirlər. Amma iki rəkət namaz qılıb mə`sum İmamlara (ə) təvəssül etmək



---

Həmin mənbə, səh. ٤١٢-٤١٣ [٩٣] -١

bundan daha yaxşıdır. Çünki İmam Zaman (ə) həm bizləri görür, həm də eşidir. Onun qeyb dövründəki ibadət, zühur edəcəyi vaxtdakı ibadətdən qat-qat üstündür. Mə`sum İmamlardan (ə) hər hansı birini ziyarət etmək, İmam Zamanı (ə) ziyarət etmək (kimidir.(١

## Çətinliklərdə ən üstün zikr

Çətinliklər zamanı oxunan ən yaxşı zikr Peyğəmbərdən (s) bizə tövsiyyə olunmuş :zikrdir

.Bu zikr mənim ümmətimi çətinliklərdə amanda saxlayacaq bir zikrdir

Böyük və üstün Allahdan başqa heç bir qüdrət və qüvvət sahibi yoxdur. Allahdan“ (Allahın qəzəbi və verəcəyi əzabdan) qurtuluş üçün kömək və pənah yeri yalnız və (yalnız Ona üz tutmaqdır.(٢

## Fitnə və ixtilaflarda haqqın me’yarı

Müsəlmanlar arasında baş verən ixtilaflar zamanı gərək həqiqi Əli (ə) tərəfdarı olan (şəxslə birgə olaq və seçdiyimiz bu yol haqq yoludur.(٣

## Fərəc duasının mə`nası

İmamlarımız bizə Axirəz-zamana yaxın baş verən sıxıntılarda bu duanı oxumağı sifariş :etmişlər

Ey Allah! Ey Rəhman! Ey Müqəllibəl-qulub! (Ey qəlbləri döndərən, dəyişən!) Bizim“ (qəlbimizi öz dinində sabit (dayanıqlı) et!”(٤

.Amma nə edək ki, dərman dalınca getmək əvəzinə dərd dalınca gedirik

;Ya müqəllibəl-qulub, səbbit qəlbi əla dinik”in mə`nası budur ki“



---

Nüktehayi-nab”, Rza Baqirzadə, səh. ٥٠-٥١“ [٩۶]-١

Həmin mənbə, səh.٧٢; “Mən la yəhzuruhül-fəqih”, c.۴, səh. ٣٧١ [٩٧]-٢

Həmin mənbə, səh. ۷۲ [۹۸] -۳

Biharül-ənvar", c. ۵۲, səh. ۱۴۸; c. ۹۲, səh. ۳۲۶; c. ۲, səh. ۳۵۱" [۹۹] -۴

".Ey Rəbbim! Bizi öz bəyəndiyin məqama çatdır və həmin məqamda saxla"

Sirat elə buradan başlayır. Əgər azacıq da olsa bu yoldan kənara çıxsaq, Allah bilir .hansı uçuruma yuvarlanacağıq

Əgər bir adamın işləri bərbaddırsa ya irəli getmiş, ya da geridə qalmışdır. Hər halda .orta həddə riayət etməmişdir

Biz mə`sum olmadığımıza görə Allah-təaladan bizə orta həddi nəsib etməsini və (bizləri həmin məqamda sabit saxlamasını istəyirik.(۱)

**Əməli tapşırıqlar**

Bir kəsin Xaliq və məxluqa etdiqadı olarsa, peyğəmbərlr və imamlarla bağlılığı olub onlara etiqadi və əməli cəhətdən təvəssül edərsə, onların buyruqlarına uyğun addım götürüb, addım atarsa, ibadətində qəlbini Allahdan qeyri bütün şeylərdən boşaldarsa, qəlbi fariq halda namaz qılarsa, şübhəli görünən məsələlərdə İmam Zamana tabe olarsa-yəni İmam kimi özünə müxalif bilirsə o da onunla müxalifətdə olsun, kimi özünə müvafiq bilirsə o da onunla müvafiq olsun; onun məl`un bildiyi kəsi o da lənətləsin, onun mərhum(۲) bildiyinə o da məhəbbət göstərsin, hətta o şəxsin .haqqında dəqiq məlumatı olmasa da

Qeyd olunan bu xüsusiyyətləri özündə əks etdirən bir şəxs heç bir kamaldan məhrum .qalmaz, heç bir nöqsana düçar olmaz

**Allahın adı ilə**

Böyük və kiçik- hamımız bilməliyik ki, dünya və axirət səadətinə çatmağın yeganə yolu Böyük Allaha bəndəlik etməkdir. Ən böyük bəndəlik etiqad və əməllərdə günahın tərkidir. Bir şeyi bildiksə ona əməl edək, bilmədiksə dayanıb məlum olana qdər ehtiyatı ...gözləməliyik. Əgər bu yolu tutsaq heç vaxt peşiman olmarıq



---

Həmin mənbə, səh. ۷۶ [۱۰۰] -۱

## ?İbadətin ləzzətini dadmaq üçün nə edək

Möhsün Qərəviyan nəql edir: Ayətullah Behcətdən soruşdum: "Ağa ömrümüz keçdi, amma indiyə qədər ibadətlərimizdə, xüsusilə də nama zlarımızda bir ləzzət hiss edə bilməmişik. S izcə nə edək ki, məsumların buyurduqları ibadətin ləzzətini azacıq da ?olsa biz də dadaq"

O, zikr və duaya məşğul olduğu halda başını qaldırıb mənalı bir ifadə ilə mənə baxdı. .Sonra–bu hamımızın mübtəla olduğu bir dərddir–deyə buyurdu

Ağa, hər halda dərəcəsi var, aşağısı–yuxarısı var; nisbi bir məsələdir; bəziləri–sizin– ?kimi–ali mərtəbəyə sahibdir. Amma bizim heç nəyimiz yoxdur. Biz nə edək

!Bəlkə də mən sizin dərəcənizin təmənnasındayam–

.Ağa, təvazökarlıqdan keçib, bu bir həqiqətdir ki, deyirəm–

.O yenə də xüsusi təvazökarlıqla: Mən də sizin kimiyəm–dedi

Çox israr etdikdən sonra nəhayət buyurdu: Namazdan həzz almaq üçün bir-neçə miqəddiməyə diqqət yetirmək lazımdır. Onlardan bir hissəsi namazın xaricindədir (namazdan qabaq), bir hissəsi isə namazın özündədir. Namazdan qabaq diqqət yetiriləsi və əməl ediləsi məsələ budur ki, insan günah etməsin, qəlbini qaraltmasın. Günah ruhu qara dumana bürüyür, qəlbin nurunu aparır. Namaz vaxtı diqqət ediləsi məsələyə gəldikdə isə insan namaz vaxtı öz ətrafına dəmirdən, tikanlı simdən "hasar" çəkməlidir ki, Allahdan qeyrisi ora daxil ola bilməsin. Allahdan başqa bütün şeyləri fikrindən çıxarmalıdır. Zehnini Allahdan qeyri heç bir şeyə məşğul etməməlidir. Əlbəttə, qeyri-ixtiyari olaraq fikri bir yerə getsə eybi yoxdur. Amma elə ki, iltifat tapıb (diqqətini cəmlədi, Allahdan qeyrilərini qəlbindən çıxarmalıdır.(١



---

Dər məzhəre büzürqan", Möhsün Qərəviyan, c. ٢, səh. ۶٩-٧٠" [١٠٢]-١

Ziyaraət haqqında üç baxış mövcuddur. Birinci baxış vəhhabilərin baxışıdır. Onlar ziyarəti şirk hesab edirlər. İkinci baxış sünnilərin və bəzi şiələrin baxışıdır. Bu dəstənin fikrinə görə imam vəfat etmişdir. Həzrət Rzanın (ə) ziyarətinə getdiklərində sanki qəbir əhlinin ziyarətinə gedirlər. Onların düşüncəsinə görə imam ölmüşdür?! Deyirlər: “Nə imamı görürük, nə də onun bizi gördüyünü düşünürük!”

Bu məsələdə bizim əksəriyyətimizin vəziyyəti elə sünnilər kimidir.

Böyük vəzifə sahibinin, məsələn prezidentin görüşünə gedəndə öz hərəkətlərimizə nə qədər diqqət yetiririk? Dediyimiz sözlərə necə diqqət edirik? Başımızı yan-yörəyə yönəltmirik. Çünki böyük bir məqam sahibinin hüzurundayıq! Həmin məqam sahibi qarşımızda dayanıb bizi görür!

Sizcə Həzrət Rzanın (ə) hüzurunda olanda həmin diqqəti, ciddiyyəti daşıyırıqmı? Sanki ölmüş bir adamın ziyarətinə gedirik. Həzrət Rza (ə) vəfat etmişdir?!

Görən bu insanlar ərəbcə söylənən ziyarətnamə sözlərinin mənasını anlayırlarmı?

Üçüncü dəstə imamı diri, hazır, nazir və qadir bilir. İmam Allahın görən gözüdür. Mömin Allahı hazır bilir. Allahın vasitəsini də hazır və nazir bilir. Mömin imamın diri olduğunu, nazir və qadir olduğunu anlayır. İmamların məqamı daha böyükdür. Mələklərdən də üstündürlər, sadəcə bizim iltifatımız kəmdir. Hərəmə gedib-gəlirik, elə bilirik ki, kimsə bizi görmür. Mələklər bizdən xəbərsiz deyillər, bizi görürlər!

Günlərin birində Kərbəlaya getmişidm. Bizim ustadımızın birinci zövcəsindən övladı olmurdu. Məndən xahiş etdi dostuma deyim ki, soruşub görsün Allah-təala nə vaxt onlara övlad əta edəcək. Çünki mənim dostum ruhları çağırmağı bacarır və cin tayfalarından bəziləri ilə əlaqə saxlayırdı. Onun tanıdığı cinlərdən ikisi İmam Hüseynin (ə) hərəmində xidmət edirdilər.

Dostum həmin iki nəfərlə əlaqə saxlayıb mənə dedi ki, gələn ilin Ramazan ayında .ustadınız övlad sahibi olacaqdır. O deyən kimi də oldu

Dostlarımdan Ağamirzə adlı birisi əhvalatı belə görüb öz gələcək təhsili haqqında maraqlandı. Cinlərlə əlaqəsi olan dostum yenə də həmin iki nəfər cinlə rabitə yaradıb bu barədə sual etdi. Cavab gəldi: "İmam Hüseynin (ə) hərəminə daxil olarkən duxul (daxil olma) izni alıb, bir dəfə öz adından, bir dəfə də başqasının naibliyi ilə İmamı "!ziyarət edən kəsə deyin ki, əgər Nəcəfə getsə müctəhid olacaqdır

Bu onu göstərir ki, ziyarətə gələnləri təkcə imam yox, hətta cinlər də görürlər və hər kəsi də tanıyırlar. Yuxarıdakı əhvalatdan aydın olur ki, hətta cinlər bu dostumuzun hər .dəfə ziyarətə gəldiyində iki dəfə İmam Hüseyni (ə) ziyarət etdiyini bilirmişlər

Sizin də ziyarətiniz canlı olmalıdır. Hərəmə daxil olarkən öncə giriş izni alın. Əgər halınız oldu hərəmə daxil olun. Həzrət Rzadan (ə) duxul izni alarkən və ərəbcə "(daxil olummu ey Allahın höccəti?!)–sözlərini deyərkən qəlbinizə müraciət edin, görün orada bir dəyişiklik yaranıbsa, deməli Həzrət (ə) sizə icazə vermişdir. Həzrət İmam Hüseynin (ə) duxul izni ağlamaqdır. Əgər izn alarkən gözünüzdən yaş gəldisə, bilin ki, Həzrət (ə) sizə giriş izni vermişdir. Bu halda daxil olun. Əgər halınız oldu hərəmə daxil olun, yox, əgər qəlbinizdə heç bir dəyişiklik hiss etmədinizsə, gördünüz əhvalınız ziyarət üçün əlverişli deyil, bu halda ziyarətdən vaz keçib yaxşı olar ki, başqa bir müstəhəbbi əmələ məşğul .olasınız

.Üç gün oruc tutun, qüsl alın və yenidən hərəmə gedib giriş icazəsi alın

İmam Rzanın (ə) ziyarəti İmam Hüseynin (ə) ziyarətindən üstündür. Çünki İmam Hüseynin (ə) ziyarətinə əksər müsəlmanlar gəlir, amma İmam Rzanın (ə) ziyarətinə .ancaq on iki imam şiələri gedirlər

.İmam Rzaya (ə) sual verib cavab alan çox olub

Kərbəlada, Nəcəfdə, Məşhəddə çox möcüzələr müşahidə olunub. Diqqətli olun! Etiqadlı !olun

.Bu müqəddəs məkanlarda ila-maşallah– nə qədər desən şəfa tapıblar

Həzrət İmam Rzaya (ə) təvəssül etmişdi, cavabını (şəfasını) Həzrət Mə’sumə (ə)... .verdi. Bu bacı və qardaş bir-birinə sıx bağlıdırlar

Bütün ziyarətnamələr təsdiq olunmuş və etibarlıdırlar. “Camieyi Kəbirə” ziyarətini oxuyun. “Əminəllah” ziyarəti də çox mühümdür. Ziyarəti qəlbiniz oxumalıdır. Öz qəlbinizin dili ilə oxuyun. Lazım deyil İmam Hüseynin (ə) hüzurunda öz hacətlərimizi dilə gətirib bir-bir sayaq; Həzrət (ə) özü bilir! Dualarınızda mübaliğə etməyin; ziyarət ürəkdən olmalıdır. İmam Rza (ə) bir nəfərə belə buyurdu: “Bəzi adamların ”!ağlamaqlarından narahatam

Böyük alimlərdən biri belə deyirdi: “Mən iki şeyə ümid edirəm. Birincisi süst və könülsüz halda Qur`an oxumamışam. İkincisi də İmam Hüseynin (ə) əzadarlığında çox ”.ağlamışam

Bəziləri Qur`anı elə oxuyurlar ki, elə bil Şahnamə oxuyurlar. Qur`ani-kərim İtrətə .bənzər bir mövcuddur

Həzrət Ayətullah Bürucerdinin gözündə ağrı peyda olmuşdu. Deyir aşura günü İmam Hüseyn (ə) əzadarlarının alınlarına yaxdıqları palçıqdan bir azını götürüb gözlərimə çəkdim. Bundan sonra dərd-ağrı birdəfəlik kəsildi və ömrümün axırına qədər göz !ağrısına mübtəla olmadım. Hətta eynək taxmağa da ehtiyac duymadım

Bir nəfər İmam Rzanın (ə) hərəminə daxil olur. Nurani bir seyyidin ədəb-ərkanla dayanıb ziyarətnamə oxuması onun diqqətini cəlb edir. Həmin seyyidə yaxınlaşıb nə oxuduğuna diqqət edir. Görür seyyid məsumların adlarını bir-bir çəkib hamısına salam !verir. İmam Zamanın (ə) adına gələndə seyyid dayanır

Həmin şəxs başa düşür ki, ziyarətnaməni oxuyan seyyid elə İmam Zamanın (ə) .özüdür

Böyük ağalardan biri nəql edir ki, filan şəxslə birlikdə həm ziyarət etmək, həm də havamızı dəyişmək üçün şəhərdən kənarda yerləşən imamzadələrdən (pir) birinə getmişdik. Belə qərarlaşmışdıq ki, yolda minik götürüb miniklə gedək. Amma minik tapa bilməyib yolu piyada getməli olduq. Mən yol getməkdən yoruldum. Ayaqlarımda bərk ağrı hiss edirdim. Dostuma dedim" "Nə oldu, bu qədər yolu piyadamı gedəcəyik. Artıq getməyə taqətim qalmayıb, aclıq da bir tərəfdən heyimizi kəsib. Çörəyimiz var, ".amma yesək susayacağıq. Su da ki yoxdur

Rəfiqim oradaca İmam Zamana (ə) təvəssül etdi və Həzrətdən belə istədi: "Ya ".Sahibəz-Zaman! Getməyə bizə bir minik yolla

Çox keçmədi ki, ətraf kəndin sakinləri buğda aparmaq üçün gətirdikləri miniklə .yolumuzun üstünə çıxdılar. Bizi də mindirib yola düşdülər

...Həzrət Rzanın(ə) hərəmində nə kəramətlər görsənməyib

Bir nəfər yuxusunda görür ki, Həzrət Rzanın (ə) hərəmindədir. Deyir bir də gördüm hərəmin günbəzi yarıldı, həzrət İsa (ə) və Həzrət Məryəm (ə) oradan hərəmə daxil oldular. Onlar üçün taxt gətirdilər. Hər ikisi həmin taxta oturub həzrət Rzanı (ə) ziyarət .etdilər

Səhərisi gün həmin şəxs hərəmə yollanır. Birdən hiss edir ki, hərəmin səs-küyü tamamilə kəsildi. Sanki hərəmdə kimsə yox idi. Bu anda Həzrət İsa (ə) və Həzrət Məryəm (ə) günbəz tərəfdən hərəmə daxil olduqlarını görür.(۱) Deyir yuxuda gördüyüm kimi onlar günbəzin yarığından hərəmə daxil olandan sonra bir taxta oturub Həzrət Rzanı (ə) ziyarət etməyə başladılar. Ziyarətanamə oxuyurdular. Elə bizim oxuduğumuz adi ziyarətnamə idi. Ziyarətnaməni oxuyub qurtarandan sonra gəldikləri yerdən də geri qayıtdılar. Bu səhnə bitəndən sonra yenə hər şey öz adi halına qayıtdı; .camaatın səs-küyü hərəmi başına aldı

Mətndə nəql olunan şəxsin ayıq halda hadisəni müşahidə etməsi göstərilir. Çox [١٠٣] -١
.ehtimal ki, mükaşifə halında olmuşdur

?İndi sizcə Həzrət Rza (ə) vəfatmı etmişdir

Axır sözüm budur ki, gəlin bildiklərimizə əməl edək. Bilmədiklərimizdə ehtiyatı (gözləyək; ehtiyyat əsası ilə hərəkət edək.(١

Əql sahiblərinə sirr deyil ki, məxluqatda olan hərəkətin əsasnaməsi, mühərriki (hərəkətə gətirəni, yaradıcı qüvvəni) tanımaqdır. Hərəkət mühərrikə möhtacdır. Bilməliyik ki, bütün şeylər hərəkətini Ondan alır, Ona doğru hərəkət edir, Onun üçün hərəkət edir. Yəni bir mümkün varlığın başlanğıcı, sonu və qərəzi anbaan məqsədə .doğru hərəkətdən ibarətdir

Alim və cahil arasındakı fərq hadisələrin əlacını tanımaqda və mərifətin yoxluğundadır. Onların sonda çatdıqları mənzilin fərqi, başlanğıcda hər birinin malik olduğu elmin .dərəcəsi arasında olan fərqə bərabərdir

Beləliklə, əgər mühərriki tanısaq, hərəkətdə olanlar arasında mövcud nizam-intizamdan mühərrikin gözəl tədbir və hikmətini dərk etsək, bizim bütün diqqətimiz .Onun təkvini və təşri`i iradəsinə yönələcəkdir

Xoş o kəsin halına ki, [öz yaradanını] tanıyır,– hətta böyük şəhidlərdən olmuş olsa da .vay tanımayanın halına,– hətta zəmanəsinin fironu olmuş olsa da

".Bu hərəkətlərin sonunda cahil deyər: "Ey kaş heç yaranmayaydım

Alim deyər: "Kaş ki, məqsədə doğru bu hərəkət yetmiş dəfə olardı; qayıdardım, ".yenidən hərəkət edərdim; haqqın yolunda şəhid olardım

Məbada öz həyatımızdan peşiman halda qayıdaq. Açıq deyirəm, –məsələn–əgər bir adamın ömrünün yarısı həqiqi nemət sahibini yad etməklə, qalan yarısı qəflətdə keçsə, [Allahı yad edərək yaşadığı] ömrünü yarısı onun həyatı, [qəflətdə keçən] qalan hissəsi .isə onun ölümü hesab edilir

Allahı tanıyan Ona müti olur. Bütün işlərinin mehvərində Allah dayanır. Allahın razılığına müvafiq bildiyi şeylərə əməl edir, bilmədiyi işlərdə məsələ

۱- [۱۰۴] Nəql olunan mətn Ayətullahül-üzma Behcətin müqəddəs Məşhəd şəhərində söylədiyi moizələrindən əxz edilmişdir.

aydın olana qədər dayanır. Mömin ömrünün hər anını öyrənir və əməl edir, bilmədiyi .yerdə dayanır

.Mömininin əməli əlindəki dəlilə görədir, dayanmağı dəlilin yoxluğu üzündəndir

Sizcə Qadir Allaha itaət silahı ilə silahlanmadan karvanımızı təhlükə ilə dolu olan bu ?yollardan salamat keçib məqsədə çata bilərikmi

Sizcə mümkündürmü ki, vücudumuz Xaliqdən, amma qüvvətimiz Ondan qeyrisindən ?olsun

Belə olan halda, əgər bu mərhələdə yəqin sahibi olduqsa, bu sifət və əhvalları əməldə həyata keçirmək üçün bilməliyik ki, həqiqəti mə'lum olmuş bu hərəkət əvvəldən axıra qədər batil iddiada olan mühərriklə (batil istəklərlə) müxalifət etməkdədir. Əgər batil istəklərə uymasaq [tək bu əməlimiz] bizi Allahın rizasına qovuşduracaq səadətimizə yetər: "Salikin sənə doğru hərəkətdə götürəcəyi ən dəyərli və üstün yol azuqəsi onun (əzimli və möhkəm iradəsidir."(١

**Nəsihət və moizə haqqında**

Allahın adı ilə

Mömin qardaş və bacılarımızdan bir qrupu [xahiş edib] nəsihət söyləməyimi istəyirlər. :Onların bu istəklərinə bir -neçə cəhətdən e'tiraz edirəm

Nəsihət cüzi məsələlərdə edilir. Moizə isə cüziyyatı və külliyyatı əhatə etməkdə daha .١ .ümumidir

.Yadlar bir-birini nəshiət etməzlər

(Hər kəs bildiyinə əməl etsə, Allah-təala onu bilmədiklərinin də varisi edər."(٢" .٢



---

.Be`sət günün duasından bir fəqərə [١٠۵]-١

(.Bihar", c. ٧٨, səh. ١٨٩. (İmam Sadiqin (ə) buyuruqlarından" [١٠۶]-٢

Hər kəs bildiyinə əməl etsə, bilmədiklərinə kifayət edər.” (Bilmədikləri işlərin hesabı“ (.ondan sorulmaz

Bizim yolumuzda cihad edib çalışanları öz yollarımıza (Bizə tərəf gətirib çıxardan“ (behişt yollarına) hidayət edəcəyik...”(١)

Bildiyinizə əməl edin. Bilmədiyiniz məsələlərdə həmin məsəl aydın olana qədər ehtiyat yolunu tutun. Əgər aydınlaşmasa bilin ki, bə’zi mə’lumatlarınızı ayaq altına qoymusunuz. [Bildiyinə] əməl etməyənin moizə təlb etməsi qəbul edilməzdir. Hökmən moizə eşitmişsiniz və bilirsiniz. Amma əməl etmədiniz. Əgər bildiklərinizə əməl etmiş .olsaydınız aydın olardınız

Hamı bilir ki, risaləni (şəri hökmlər risaləsi) götürüb oxumalıdır, anlayıb əməldə tətbiq .٣ .etməlidir; halalı, haramı onunla aydınlaşdırmalıdır

”.Belə isə deyə bilməzlər: “Biz bilmirik nə edək, nə etməyək

Əqidəniz olduğu (etibarlı bilib, inandığınız) şəxslərin əməllərinə nəzər yetirin. Onların .۴ .etdiklərini ixtiyari olaraq siz də edin, etmədiklərini ixtiyari olaraq siz də etməyin

Bu, ali məqsədlərə qovuşmaqda ən yaxşı yollardan biridir. Dilinizdən qeyri [yollarla] ”.(əməl, rəftar, əxlaqınızla) Allaha də’vət edənlərdən olun

.Əməllə edilən moizə dillə edilən moizədən daha üstün və təsirlidir

Hər gün Qur`an oxumaq [lazımdır] –öz yerində–aydın məsələlərdəndir. Hər namazın .۵ öz təqibatını (gündəlik zikri, duası), həmçinin hər vaxtın və məkanın münasib duasını da oxuyun. Məscidlərə, şərəfli ziyarətgahlara çox gedin. Alimlərə, saleh insanlara tez-tez baş çəkin, onlarla oturub-durun. Bu, Allahın və rəsulunun bəyəndiyi xüsusiyyətlərdəndir. Alimlər, saleh bəndələrlə oturub-durmaq günbəgün insanın bəsirətini aydınlaşdırır, ibadət, tilavət və ziyarətlə daha artıq ünsiyyət yaratmasına .səbəb olur

Əksinə, qəflət əhli ilə oturub-durmaq qəlbin qəsavətini, zülmətini artırır, insanı ibadətdən, ziyarətdən soyudur. Bu səbəbdəndir ki, insanın

ibadətdən, ziyarətdən əldə etdiyi xoş ruhiyyəsi imanı zəif insanlarla oturub-durmaqla bədbin əhval-ruhiyyəyə çevrilir. Bunun üçün də zəif imanlı insanlarla zəruri səbəb və ya onları hidayət məqsədi olmadığı surətdə oturub-durmaq insanın öz müsbət xüsusiyyətini əldən verməsinə səbəb olur, bəlkə də onların pis xüsusiyyətlər .mənimsəməsinə gətirib çıxardır

Gördüyünüzdə Allahı sizin yadınıza salan, danışıqları elminizi artıran, əməlləri sizi“ ”.axirətə rəğbətləndirən kəslərlə oturub-durun

E’tiqad və əməldə günahın tərki də bilməli olacağınız aydın məsələlərdəndir. Buna.۶ əməl etsəniz Allahdan qeyrisinə möhtac olmazsınız. Yəni [bilin ki,] başqası Allaha .möhtacdır, Allah başqasına möhtac deyil

.Allah xeyir yetirən və bəlaları dəf edəndir

(Mən cin və insanları ancaq Mənə ibadət etsinlər deyə yaratdım.”(۱“

Bəziləri elə güman edirlər ki, günahın tərkini adlayıb keçmişlər! (Artıq günah etmirlər) Daha bilmirlər ki, günah ancaq bildiyimiz kəbirə (böyük) günahlardan ibarət deyil. Səğirə (kiçik) günahlarda israr etməyin (günahı təkrarlamaq) özü də böyük günahdır. Məsələn, qorxutmaq, incitmək məqsədiliə fağır adama acıqlı baxışla baxmağın özü haramdır. Həmçinin təşviq, təsdiq məqsədilə güanhkarın üzünə gülümsəmək .günahdır

Alimlərdən, saleh insanlardan uzaq düşmək din oğrularının əlini-qolunu açır, onlara .möminlərin imanını satın almağa fürsət yaradır. Tarixdə belə şeylər çox görünüb

Allahdan istəyirik ki, dünya və axirət səadətinin açarı olan günahı həmişəlik və qəti əzmlə tərk etməkdə bizi müvəffəq etsin, islamın şərif bayramlarını və [əldə edilən] imanı bizim [həqiqi] bayramımız qərar versin. Bununla günahın tərki bizdə bir mələkəyə [zatı bir xüsusiyyətə, adətə] çevrilsin. Mələkə sahibi üçün günah etmək .susuz bir insanın zəhər içməsi kimidir

səh:۱۲۰

---

Əlbəttə, əgər bu yolu getmək axıra qədər müşkül olsaydı, mehriban Allah tərəfindən (bu qədər rəğbət və məhəbbət göstərilməzdi.(١



---

Ayətullahül-üzma Behcətin lentə alınmış çıxışlarından və həmçinin şagirdləri [١٠٩] -١ .tərəfindən qeyd olunmuş yaddaşlardan əxz edilmişdir

:Sual ١: Həzrət Ayətullahül-Üzma Behcətin mübarək məhzərinə

Əvvəlcə salam və ehtiramımı ərz edib öz problemlərimə görə qiymətli vaxtınızı aldığım üçün sizdən üzr istəyirəm. Mən “biznes” sahəsində fəaliyyətə qoşularaq bütün var-yoxumu əldən çıxarmışam. Bu üzdən, düşdüyüm ziyandan çıxmaq, borclarımı qaytarmaq üçün hara müraciət edirəmsə bir şey çıxmır. İxtiyarımda olan mülkü satıb bu yolla camaatın borcunu qaytarmaq istəyirəm, amma işlərim alınmır. Buna görə də əlim hər yerdən üzülüb. Məsələn, mülkü satışa çıxarıram, çoxlu müştəri tapılır,... işin əvvəli yaxşı gedir, amma sonda bir nəticə çıxmır. Sizdən acizanə xahiş edirəm ki, mənim əlimdən tutasınız. Ümidvaram, sizin xeyir-duanız və hidayətinizlə mənim .çətinliyim həll olsun

Cavab: “Allahın adı ilə. Şərəfli “istiğfar” zikrini(١) çox təkrar edin və [bu zikri deməkdən] ”.yorulmayın. Allah sizə tofiq versin! Vəssəlam

:Sual ٢: Həzrət Ayətullahul-Üzma Behcətin mübarək məhzərinə

Salam əleyküm. Bildiriş üçün deyim ki, mən Gilan vilayəti Rudsər şəhərinin ətraf kəndlərindən birinin sakiniyəm. Sənətim fəhləlikdir. Bir neçə il olar ki, ailə qurmuşam. İki övladım var. Uşaqlıq illərində ata-anamı itirib yetim böyümüşəm. Ailə qurduğum ilk illərdə dolanışığım yaxşı idi. Özümə bir ev də tikmişdim. Amma yeni evə köçəndən sonra müxtəlif problemlərlə qarşılaşmalı oldum. Qazancım orta həddədir. Lakin qazancımın çoxusu dərmanlara, xəstəxanalara xərclənir. Ümumi götürsək, gəlirimin ٩٠ faizi özümün, yoldaşımın, ya da uşaqların xəstəliklərinə–həkimlərə, dava-dərmana sərf olur. Bu vəziyyət neçə ildir davam edir. Xəstəliklərin çoxusu birdən-birə, gözləmədiyimiz halda qarşıya çıxır. Bə`ziləri bizim bu halımıza baxıb deyirlər: Sizi tilsimə salıblar, ya da gözə gəlmisiniz. Özüm də bilmirəm bu qədər problem



---

١- [١١٠] “Əstəğfirullahə rəbbi və ətubu iləyh”.

haradan yaranır, niyə bu qədər çətinliklərə mübtəla oluruq. Bunun üçün də sizdən .xeyir-dua zikri və xüsusi əməli tapşırıqla kömək etməyinizi xahiş edirəm

Cavab: “Allahın adı ilə. Sədəqə verməklə bərabər “müəvvəzətəyn”i(۱) həmişə deyin, şərif “La hövlə və la quvvətə illa-billah”ı çox zikr edin. Allah sizi müvəffəq etsin. (Vəssəlam.”(۲

Sual ۳: Neçə vaxtdır ki, bir nəfərin məhəbbətində əsir olmuşam. Necə deyərlər, ağlın ?cilovunu əldən vermişəm. Nə edim

Cavab: “Aqil insan kamalda, gözəllikdə, davamda, mənfəət yetirməkdə ən üstün olana məhəbbət yetirər. Onun məhəbbətini digərlərinin məhəbbətindən üstün tutar. Ən kamil olanın məhəbbəti digərlərinin məhəbbətinin əksinə olaraq şər və bəlanı ”.insandan dəf edər

Sual ۴: Xahiş edirik namaz haqqında qısa və aydın elə bir cümlə buyurasınız ki, hər .zaman gözlərimiz önündə olub qəlbimizə həkk edilsin

Cavab: “Allahın adı ilə. Yüksək mərtəbədə yerləşən namazın fəziləti haqqında buyurulmuş ali bəyanlardan biri mə`sumlardan (ə) birinin məşhur olan bu kəlamıdır: .Namaz mö`minin me`racıdır

Doğruluğuna yəqin hasil edib bu ali məqamın tələbində israrlı olan və onu ”.unutmayanlar üçün tək bu cümlə yetərlidir

Sual ۵: Xahiş edirəm buyurasınız ki, Allah və pak imamlarla daha yaxşı ünsiyyət ?yaratmaq üçün nə etmək lazımdır

Cavab: “Allah-təalaya, Peyğəmbərə (s) və imamlara itaət, e`tiqad və əməldə günahı ”.tərk etmək

səh:۱۲۳

---

.Fələq” və “Nas” surələri nəzərdə tutulur“ [۱۱۱]-۱

Rza Baqirzadə, “Nüqtehaye nab”, səh. ۲۸-۲۹ [۱۱۲]-۲

Sual ۶: İlahi buyuruqları yerinə yetirərkən, xüsusi ilə namaz qılarkən Allaha təslim halını ?(xüzu` və xuşu`) almaq üçün nə etmək lazımdır

Cavab: “Namazdan qabaq İmam Zamana həqiqi təvəssül etmək, mütləq niyyətlə ”.əməli yerinə yetirmək

?Sual ۷: Riyadan uzaqlaşmaq üçün nə etmək lazımdır

”.Cavab: “Kamil inamla çoxlu “həvqələ” (la hövlə və la quvvətə illa billah) demək

?Sual ۸: Əsəbiliyin dərmanı üçün nə edək

Cavab: “Kamil inamla çoxlu salavat (Allahummə səlli əla Muhəmməd və ali ”.Muhəmməd) göndərmək

Sual ۹: Dərs deməkdən, Allah-təalanın kitabı və Əhli-beyt təfsirini oxumağa sə`y ?etməkdən başqa hansı işlə təqva və Allaha doğru meyli gücləndirmək olar

Cavab: “Allahın adı ilə. E`tiqad və əməldə günahın tərk edilməsinə dair verilən qəti və ”.daimi qərarla

Sual ۱۰: Tələbələrdən bə`ziləri bizə müraciət edib onlara əxlaqi tövsiyyələr verməyimizi xahiş edir, həmçinin nəfsin saflaşdırılması barədə soruşurlar. Buna görə .də xahiş edirik bu mühüm işdə bizə yol göstərəsiniz

Cavab: “Allahın adı ilə. Bu işdə faydalı olacaq ən böyük əməllərdən biri budur ki, hər gün sizin yanınıza dərs almağa gələn tələbələrə “Vəsailüş-şiə” kitabının “cihad” bölümündə nəfslə cihada aid əxlaqi bir rəvayət, həmçinin “Vəsail”in həcc bölümündə “adabül-işrət” babından müəyyən bir rəvayəti [dərsdən qabaq] oxuyub açıqlayasınız. Bu şərtlə ki, deyilən

”.rəvayətlər düşüncə və tədbirlə, onları əməldə tətbiq etmək qəsdi ilə zikr edilsin

Sual ۱۱: Bə`zi tələbələr bizdən “riya”, “ücb”, “kibr”, “şəhvət” və sair haqqında ?soruşurlar. Sizin bu barədə şərif nəzəriniz nədir

Cavab: “Allahın adı ilə. Bütün bu rəzil sifətlərin mənşəyi Allaha qarşı mə`rifətin (Allahı tanımağın) az olmasıdır. Bu sifətlər ibadətdə munislərin munisi Allah-təala ilə ünsiyyət yaratmaqla dəf olur. Əgər insan bilsə ki, Allah-təala bütün hallarda və zamanlarda hər ”.yaxşıdan daha yaxşıdır, Onunla ünsiyyətdən ayrılmaz

Sual ۱۲: [Namazda] fikri toplayıb, yalnız Allah haqda fikirləşmək üçün nə etmək ?lazımdır

Cavab: “Allah-təalanı tanıyıb Onunla munis olan kəsin diqqəti Allahdan yayınmamalıdır. Ona deyilir ki, ancaq həyatın zəruri işlərinə görə ondan ayrıl. Daha ona deyilmir ki, zəruri hacətlərini də bir kənara qoyub, ancaq diqqəti Allaha yönəlt. Əgər namaz qılan ”.şəxs bilsə ki, Allahın camalı onu necə əhatə edibdir, heç vaxt namazdan yorulmaz

Sual ۱۳: Allaha doğru hərəkətdə (seyri-süluk yolunda) hökmən ustad olmalıdırmı? Əgər ?fərz etsək ki, ustad yoxdur, çarə nədir

Cavab: “Allahın adı ilə. Sənin ustadın sənin elmindir. Bildiyinə əməl et və bilmədiyin ”.şeyə görə vəzifən yoxdur

?Sual ۱۴: Həqiqi zöhd nədir? Necə həqiqi zahid olmaq olar

Cavab: “Zöhd odur ki, öz nəfsinin ağası olasan. Hər əməl və qadağada Allah-təalanın ”.buyuruğundan çıxmayasan

səh:۱۲۵

Sual ۱۵: Əhli-beytə, xüsusilə də İmam Zamana (ə) qarşı məhəbbətimizi necə ?gücləndirə bilərik

Cavab: "Allahı tanıyandan sonra buyuruqlarına boyun əymək Ona qarşı məhəbbətin yaranmasına və beləliklə, Allahın sevdiyi kəslərə də məhəbbət bəsləməyə səbəb olar. Peyğəmbərlər və vəsiləri, o cümlədən Həzrət Məhəmməd (s) və pak ailəsi Allaha ən ".sevimli kəslərdir. Onların bizə ən yaxın olanı Sahibəz-zamandır

.Sual ۱۶: Allahı tanımağın yolu nədir? Əgər mümkünsə yol göstərin

Cavab: "Allahı tanımağın yolu insanın özünü tanımasındadır. Biz ki, özümüz özümüzü yaratmamışıq və bu işi bacarmarıq. Başqası da əgər bizim kimidirsə, nə özünü, nə də bizi yaratmamış və yarada da bilməz. Deməli, bizi mütləq qadir yaratmışdır. O, Allahdır. Ona yaxınlaşmağın yolu ne`mət verənə şükür etmək, itaət göstərməkdir. İtaətin məşəqqəti ötəridir. Çox keçmir ki, Ona yaxınlaşmaq tələbində olanlara [Allaha etdikləri ".ibadət və itaətləri] hər şeydən şirin gəlir

?Sual ۱۷: Ən üstün zikr hansıdır

Cavab: "Nəzərimcə ən üstün zikr əməli zikrdir. Yə`ni e`tiqad və əməldə günahın tərk edilməsidir. Hər şey ondan asılıdır, amma özü bir şeyə möhtac deyil və xeyir-bərəkət ".mənbəyidir

Sual ۱۸: Allaha yaxınlaşmaq istəyirəm. Lütfən, mənə yol göstərin. Bu işdə ustada ?ehtiyac varmı

Cavab: "Allahın adı ilə. Ustad elmdir. Müəllim vasitədir. Öz mə`lumatınıza əməl edin. Bildiklərinizi ayaq altına atmayın. Bu hədis–"Öz bildiklərinə əməl edən kəsi Allah –bilmədiklərinin də varisi edər"(۱) və Qur`ani-kərimin bu ayəsi



---

Bihar", c. ۷۹, səh. ۱۸۹" [۱۱۳]-۱

Bizim yolumuzda cihad edib çalışanları Öz yollarımıza hidayət edəcəyik”(۱) sizə“ .kifayətdir

Əgər bir nəticəsi olmasa, bilin ki, ona əməl etməmisiniz. Gün ərzində bir saatınızı da ”.dini elmləri öyrənməyə ayırın

?Sual ۱۹: Qürurdan yaxa qurtarmaq üçün hansı yolu tövsiyyə edirsiniz

”.Cavab: “Allahın adı ilə. Qürurun əlacı çoxlu “həvqələ”(۲) deməkdir

?Sual ۲۰: Namazda qəlbin hazırlığı və fikri cəmləmək üçün nə etmək lazımdır

Cavab: “Allahın adı ilə. Həmin anda ki, anladınız fikriniz başqa yerdədir tez fikrinizi ”.toplayıb namaza qayıdın. İxtiyari olaraq namazdan yayınmayın

Sual ۲۱: Mən vəsvəsə xəstəliyinə tutulmuşam. Lütfən, onun aradan qaldırılması üçün .mənə yol göstərin

”.Cavab: “Çoxlu “təhlil”(۳) demək vəsvəsənin əlacıdır

Sual ۲۲: Əxlaqda hər hansı bir əmələ yiyələnmək üçün özümə bir proqram tuturam. Hətta and verib nəzir də boyun oluram. Amma bir müddətdən sonra iradəm süstləşir, ?məğlub oluram. Nə edim

Cavab: “Bir dəqiqə də olsa özünüzü Allahı yad edən görəndə ixtiyari olaraq bu haldan ”.çıxmayın. Əgər qeyri-ixtiyari, qəflət üzündən olsa, eybi yoxdur, fikir verməyin



---

.Ənkəbut”, ۶۹“ [۱۱۴]-۱

”La hövlə və la quvvətə illa billah“ [۱۱۵]-۲

.La ilahə illəllah” zikri nəzərdə tutulur“ [۱۱۶]-۳

?Sual ٢٣: İstəyirəm Allaha yaxın olum, seyri-süluka qədəm qoyum, yolu nədir

Cavab: "Allahın adı ilə. Əgər talib (bu istəyin tələbində olan) sadiq olsa (istəyində və niyyətində düz olsa), günahın tərki bütün ömür üçün kifayət edər, hətta ömrü min il (olsa da."(١)

Bunu deyib tez əlilə işarə edərək buyurdu: "Ruhun təcərrüdü belə olur." Həmin şagird deyirdi: "Ustadın işarəsindən sonra həmin anda bədənimdən ayrılıb, öz kənarımda .özüm kimi bir varlığı müşahidə etdiyimi gördüm. Risaleyi Lobbul-lübab, səh. ٣٥-٣٦

.Biharül-ənvar", Əllamə Məclisi", ١٤-cü cild, səh. ١٨٥, ٣٦-cı hədis"

səh:١٢٨

---

Sual-cavab" bölümü əsasən, Seyyid Mehdi Sainin "Məhbuba doğru" kitabından" [١١٧] -١ .əxz edilmişdir

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ٩

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ٢٠٠۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.١

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.٢ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .٣ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.١

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.۷.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹